və alihi və səlləmin buyurduqlarını Zübeyrə xatırladıb dedi: “Ey Zübeyr, sən zalımsan Əli (əleyhissalam)-ın müharibəsinə gedirsən.” Zübeyr peşman olub müharibədən əl ,çəkdi. Meydandan qayıtdıqda Aişə onu görüb dedi: “And olsun Allaha

mən hansı müharibədə olmuşamsa, yüz faiz agahlıq üzündən döyüşmüşəm, amma bu .müharibədə şəkkdə qalmışam və sərgərdanam

Aişə dedi: Belə güman edirəm ki, Əbu Talib oğlunun qılıncından qorxdun ki, onun qılıncı daha iti və kəsicidir, əgər ondan qorxmursansa bu heç də təəccüblü deyildir. Çünki, .səndən qabaq çoxları bu qılıncdan qorxub geri çəkilmişlər

Zübeyr dedi: Heç də fikirləşdiyin kimi deyil. Mənim geri çəkilməyimin səbəbi əvvəldə dediyimdir. (yəni Əlinin qoşununa qarşı vuruşmaqda şübhəm vardır ki, düzdür ya .yox?). Sonra Zübeyr müharibədən əl çəkib Bəsrə cəbhəsindən uzaqlaşdı

### ON YEDDİNCİ HEKAYƏT – Yamaqlı ayaqqabı

Əli (əleyhissalam)-ın ordusu Kufədən çıxıb müharibə qızışdıranları məhv etmək üçün Bəsryə tərəf hərəkət edirdi. Ordular Ziyqar məhəlləsinə (Bəsrənin yaxınlığında) çatdıqda dinclərini almaq üçün orada dayandılar. Abdullah ibni Abbas deyir: Mən də orduda idim və Əli (əleyhissalam)-ın hüzuruna gəldikdə Həzrətin öz ayaqqabısını yamamaqla məşğul olduğunu gördüm. Həzrət mənə buyurdu: “Bu başmağın qiyməti nə qədər olar?” Dedim: “Qiyməti yoxdur.” (yəni qiymətsizdir!) Buyurdu: “And olsun Allaha, bu dəyərsiz başmaq mənim üçün hökumət və rəyasətdən daha sevimlidir. Belə ki, eləyə bilim bu hökumətlə bir haqqı dirildərək batili məhv edəm.” Sonra qalxıb camaat üçün çıxış etdi. Bu çıxışda Həzrət belə buyurdu: “And olsun Allaha, mən Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm zamanında İslam qoşununun başçısı idim və onları irəliyə hərəkət etdirirdim. Beləliklə nahaq qoşunlar geri otuzduruldu. Nəhayət haqq aşkar oldu. Bu yolda heç bir zaman süstlük və zəiflik göstərib qorxmadı. ”.Elə indinin özündə də bu hədəf uğrunda vuruşuram

### !?ON SƏKKİZİNCİ HEKAYƏT – Din ya qeyrət

Naman ibni Bəşir düşmən havadarlarından biri idi. Bir gün o Müaviyədən Əli (əleyhissalam)-ın hökumət dairəsində olan vilayətlərini işğal etmək məqsədilə qoşun istədi. Müaviyə də onu iki min nəfərə yaxın döyüşçü olan bir qoşuna başçı təyin etdi. Bu zaman Nalan ibni Bəşir iki min nəfərlik ordu ilə Eynut-təmr qəsəbəsinə hücum etməyi qərara aldı. Əli

əleyhissalam) tərəfindən Malik ibni Kə"b bu qəsəbəyə hakim təyin edilmişdi. Düşmən) qəsəbəyə həmlə edən zaman Malik ibni Kə"bin min nəfərdən artıq köməkçisi yox idi. .Bu zaman Əli (əleyhissalam)-a bir məktub yazdı

.Həmin məktubda vəziyyəti olduğu kimi Həzrətə məlumat verib ondan kömək istədi

Hələ köməklər gəlib çatmamışdı ki, Naman Malikə həmlə etdi. Nəticədə Malik də öz yoldaşları ilə birgə özünü müdafiəyə başladı, Malik və köməkçiləri sanki sözü bir yerə qoyub qılınclarının qılafını sındırmışdılar ki, düşməni məğlub etməyincə bir də öz şəmşirlərini qılafa qoymasınlar. Bu zaman Malik öz köməkçilərindən sayılan Abdullah Əzdi ni Eynut Təmrin yaxınlığında yaşayan İmamın yaxın silahdaşlarından kömək almağa göndərdi Əzdi də ora gedib Muxnəf ibni Səlim dən ٥٠ nəfər kömək aldı. Bunu gördükdə İslam döyüşçülərinin əhval-ruhiyyəsi bir azd da qüvvətləndi. Saylarının az .olmalarına baxmayaraq qoşununu məğlubiyyətə uğratdılar

Əli (əleyhissalam)-ın qoşununa kömək və qüvvə gələcəyindən qorxan Naman gecə ikən Şama tərəf qaçdı. Nəticədə Eynut-təmr qəsəbəsi alnı-açıq Əli (əleyhissalam)-ın silahdaşlarının əlində qaldı. Bu zaman Malik Eynut-Təmrin başçısı Əli (əleyhissalam)-a bir məktub yazaraq İslam qoşununun vəziyyətini Həzrətə elan edib bildirdi: Malikin ilk naməsi Əli (əleyhissalam)-ın əlinə çatdıqda camaatı toplayıb onlar üçün xütbə oxudu və onları Eynut- Təmr cəbhəsinə kömək etməyə çağırdı. Bu vaxt camaatdakı süstlüyü :sezib onlara qarşı qəzəblənən Əli (əleyhissalam) ora toplaşanlara belə buyurdu

Məgər dininiz yoxdur ki, sizləri öz ətrafına toplasın ya qeyrətsizsinizmi ki, düşmənin cəsarətinə baxıb susursunuz. Aranızda durub kömək üçün nə qədər fəryad etsəm belə !!?.məni dinləmirsiniz

Siz mənim göstərişlərimi yerinə yetirmirsiniz. Bu zaman Yalnız Ədi ibni Hatəm Əli (əleyhissalam)-a müsbət cavab verərək Təy qəbiləsindən min nəfərin bu döyüşdə .hazır olduğunu bildirdi

İmam onlara Nuxəylə ordusuna tərəf getmələrini tapşırdı. Hərəkət əmrinin verilməsini gözləyirdilər ki, bu zaman Malikin ikinci məktubu yetişdi və Əli (əleyhissalam) bu qələbədən çox xoşhal oldu. Həzrət gəlmiş məktubu Kufə camaatı üçün oxuyub Allaha

.həmd-səna etdi

## ON DOQQUZUNCU HEKAYƏT.Həkəməyn əhvalatı

Möminlər ağası Həzrət Əli (əleyhissalam)-ın xilafəti dövründə baş verən ən mühüm hadisələrdən biri də Həkəmeyn əhvalatıdır ki, onu burada xülasə də olmuş olsa qeyd etməyi lazım bildik. Həzrət Əli (əleyhissalam) ۳۶ hicri ilinin Şəvval ayının ۵ də

ki, bu da hökumətinin birinci ilinə təsadüf edir. Müaviyənin təcavüzkar ordusunun məğlubiyyətə uğratmaq üçün silahdaşları ilə birlikdə Siffeyn vilayətinə (İraqla Şam arasında) yola düşür. Bu müharibə ١٨ ay davam edir. Müharibənin sonunda artıq Əli (əleyhissalam) qələbəsi ehtimalı möhkəmlənmir. Müaviyə ordusunun isə məğlubiyyət .nişanələri sezilirdi

Bu həlledici böhranda məl"un Əmr As tərəfindən (Müaviyənin xüsusi müşaviri) bir hiylə .quruldu

Belə ki, Müaviyə ordusunun Quranları nizə başına keçirmələri planlaşdırıldı, eləcə də qoşunun "Ey Əli (əleyhissalam)-ın ordusu gəlin hər iki tərəf arasında Quran hakim .olsun. Quran hər nə hökm etsə onlu qəbul edək

.Müharibə və qan axıdılmasının qarşısını alın

Zahirdə xoş, batində isə aldadıcı sui-qəsddən savayı bir şey olmayan baş tumuş hiylə əsgərləri aldatdı. Daha Həzrətin müharibəni davam etdirmək barədə əmrlərinin dinləmədilər. Həzrət bunun Müaviyə ilə Əmr Asın aldadıcı hiylələri olmasını onlara başa saldısa da əsgərlərdən bir çoxu Əlinin (əleyhissalam) sözünə etina etmədi. Elə bunlar .görə də Əli (əleyhissalam)-ın ordusunda ziddiyyət əmələ gəldi

Nəticədə Müaviyənin ordusu müqəddəs kitabın fərmanını məhv edib tapdadılar. Bu ziyan verici hiylə nəticəsində Əli (əleyhissalam)-ın ətrafındakıları aldatdılar. Həzrət Əli (əleyhissalam) onlara nə qədər nəsihət etdisə də ona qulaq asan tapılmadı. Bu zaman :İmam Allaha pənah aparıb belə buyurdu

Allahım, sən bilirsən ki, onların hədəfi Quran deyildi." Sözün qısası budur ki, Əli" (əleyhissalam)-ın minlərlə yaxın köməkçlərindən, eləcə də Əş"əs ibni Qeys (münafiqlərin başçısı) din və əqidə oğrularının zahirdəki aldadıcı oyunları ilə həmin əqidədən sui istifadə edərək hətta Müaviyə tərəfdarlarından daha alçaqcasına Əli :(əleyhissalam)-ın ətrafını tutdular və belə fəryad edib dedilər

Allahın əmrindən başqa fərman yoxdur." onlar Həzrət Əli (əleyhissalam)-a Müaviyə ilə" müharibəni dayandırmağı qəbul etdirdilər ki, məktubundan sonra Həkəmiyyət

mövzusunu irəli çəkdilər. Belə ki, həm İmam Əli (əleyhissalam), həm də Müaviyə .ordusu tərəfindən bir nəfər nümayəndə təyin olunsun

Həzrət Əli (əleyhissalam) Həkəmiyyətə qol qoymağa məcbur edildikdən sonra Abdullah ibni Abbası öz nümayəndəsi kimi təklif etdi. Çünki, məhz Abdullah Əmr Asın .aldadıcı hiyləsinin öhdəsindən yaxşılıqla gələ bilərdi

Müaviyə də Əmr Ası nümayəndə ünvanıyla təyin etmişdi. Əş"əs ibni Qeys Müaviyənin gizli qasidi idi. O, ibni Abbasın bu həkəmiyyətdə olmasına qarşı çıxdıqda Həzrət Əli (əleyhissalam) Malik Əştərin nünayəndəliyini irəli sürdü. Bu seçki ilə də müxalifət olunduqda vəhdəti qorumaqdan ötrü Əli (əleyhissalam) məcbur oldu ki, onların təklif etdiyi Əbu Musanın Həkəmiyyətini qəbul etsin. Qərardaddan sonra yenə də bir qrupun .bu qərardadı qəbul etmələri bildirildi

"Hökumət yalnız Allaha məxsusdur"

Əmr As qırx nəfərlə Əbu Musa isə dörd yüz nəfərlə Dəvmətil cundəl də (Həkəmiyyət məhəllində) hazır olduqda müzakirənin sonunda hiyləgər Əmr As tam xüsusi bir ?iclasda nadan Əbu Musadan son nəzərini soruşub dedi: Son nəzərin nədir

Əbu Musa dedi: Mən hər ikisini (Əli və Müaviyəni) xilafətdən götürür müsəlmanları isə xəlifə seçmək üçün şuraya dəvət edirəm. Əmr As öz hiyləsinin baş tutduğunu .gördükdə yalandan and içdi ki, bu yaxşı fikirdir

Ümumi iclas qurulduqda Əmr As Əbu Musaya dedi: Sən də öz fikrini söylə Əbu Musa fikir söyləməkdə qabağa düşməsini israr etsə də o qabağa düşüb dedi: "Mən Əli və Müaviyəni xilafətdən kənarlaşdırıram. Özünüz yığışıb yeni bir xəlifə seçin." Bu zaman Hiyləgər Əmr As cəldə yerindən durub: Əbu Musanın dediyini eşitdiniz. O öz rəisi Əli (əleyhissalam)-ı xilafətdən götürdü, yəni kənarlaşdırdı, elə mən də onu kənar hesab edib yerində isə öz rəisim Müaviyəni təyin edirəm, deyib öz üzüyünü sağ əlinədn çıxardıb sol əlinə keçirdi və Əli (əleyhissalam)-ı viladətdən bu cür çıxarıb Müaviyəni .onun yerinə nəsb edirəm-dedi

Yuxarıda qeyd olunan Əli (əleyhissalam)-ın xilafəti zamanı ən iyrənc və siyasi hadisələrdən biri hesab olunur. Məhz Həkəmeyn əhvalatı da həmin Xəvariclər iəmələ gətirmişdilər. Baxmayaraq ki, Əli (əleyhissalam) Əgər Abdullah ibni Abbası bəyənmirsinizsə onda yerinə Malik Əştəri göndərin- deyə buyurmuşdu, ancaq Əş"əs .və onun əshabı isə cavabında belə demişdilər

Biz Əbu Musadan başqa bir kəsi təyin edə bilmərik. "Hər halda o şey ki, olacaqdı oldu" lakin çox təəccüblü idi ki, çirkin Həkəmeyn macərasının bais və baniləri sonradan öz peşmanlıqlarını büruzə verərək tam həyasızlıqla bütün günahları Əli (əleyhissalam)-ın :boynuna yıxıb dedilər

Axı Əli niyə bu təhkimə razı oldu? Elə buna görə də Əli kafirdir." Bunlar dəfələrlə Əli" (əleyhissalam)-ın hüzuruna gəlib fəryad edirdilər: "Hökumət Allaha məxsusdur!!!" İndi qayıdaq əsl mətləbə: Dastanın seçilmiş hissələrinin şərhində Xəvaricin (iman və əqidə oğrularının) şüardarının "Hökumət Allaha məxsusdur." olmasını və bu cazibəli şüarla camaatı aldatmasını başa düşdük. Məhz bunlar idi ki, camaatı Əli (əleyhissalam)-ın əleyhinə qaldıraraq həyatda ən böyük zərbəni o Həzrətin ilahi hökumətinə varid :etdilər. Möminlər ağası Həzrət Əli (əleyhissalam) buyurdu

Bu haqqın öz sözü idi, lakin bu sözdən batil bir şəkildə istifadə edildi bəli hökumət və" ".hökm Allaha məxsusdur

Beləliklə, o, Xəvaricin nadürüst əqidə və nifaq yaradan simalarını xalqa nümayiş etdirərək onlara xəbərdarlıq etdi ki, din maskası arxasında müharibəyə gələnlərə .inanmayın

## İYİRMİNCİ HEKAYƏT – Səbr və dözüm

İmam Əli (əleyhissalam) həmişə səy edirdi ki, bacardığı qədər düşmənlərlə ortaya çıxan problemləri səbr, həvəs və dözümlə həll edib imkan dairəsində müharibəyə qol qoymasın, habelə müharibəni başlayan ilk şəxslərdən hesab olunmasın. Həzrətin .müharibəsi bir növ müdafiə xarakteri daşıyırdı

Əli (əleyhissalam)-ın ən qəddar düşməni) olan Müaviyəyə gəldikdə isə, Həzrət ilk növbədə ona müxtəlif məktublar, eləcə də bir çox qasidlər göndərdi ki, xalqın müxtəlif .problemləri Allahın əmrlərinə əməl etmək yolu ilə həll edilsin

Məsələn: İmam Əli (əleyhissalam) Şam əhlindən olan Cərir ibni Abdullaha bir məktub verib onu Müaviyənin yanına göndərdi. Cərir Əli (əleyhissalam)-ın məktubunu Müaviyəyə çatdırıb onları Həzrətin doğru yolu ilə getməyə dəvət edərək Müaviyəyə dedi: "Sən də müsəlmanların seçdikləri yolu seç! Daha demə ki, mən Şamda Osmanın ".valisiyəm

Müsəlmanların xəlifəsi Əli (əleyhissalam)-dır və gərək ona tabe olasan. Müaviyə zahir cavabında belə dedi: Bu barədə fikirəşməyin, lakin Əli (əleyhissalam)-ın onu öz vəzifəsində saxlamağa qadir olmadığını duyduqda camaatı Əli (əleyhissalam)-ın .əleyhinə qaldırırdı

Cərir Müaviyədən məyus olduqda Kufəyə qayıtdı çox təəssüflər olsun ki, Kufə camaatı da ona qarşı çıxaraq Cəriri Müaviyənin tərəfdarı adlandırdılar. Bu böhtandan narahat olan Cərir Kufədən Qırqısa adasına gələrək ömrünün sonuna qədər orada yaşadı. Əli (əleyhissalam)-ın əshabı Həzrətin Müaviyə ilə müharibəyə qalxmasını təkid edirdilər. (Əlbəttə bu hazırlıq müharibə elan etmək idi). Amma Əli (əleyhissalam)-ın metodu isə başqa idi. O özünün müharibəni başlayan ilk şəxs olmasını istəmirdi. Böyük inqilabi səbr və dözümlə öz işlərini əncam verirdi. Həzrət sülh qapılarını bağlamaq istəmirdi. Cəririn Şamdan Kufəyə gəlməsini nəzərə almaqla Həzrət bu barədə əshaba belə :buyurdu

Mənim Şam camaatı ilə müharibəyə qarşı olan səfərbərliyim onlarla sülh bağlamaq" deməkdir. Eləcə də əgər yaxşı iş görmək istəsələr bu yaxşı işin yolunu onların üzünə ".bağlamaq mənasındadır

Beləliklə Əli (əleyhissalam) müharibəni ilk başlamaq təşəbbüsünü qəbul etmədi. Həmişə çalışırdı ki, adamları haqq yoluna hidayət etsin. Elə buna görə də bu yolda çox .səbrli və dözümlü idi

## İYİRMİ BİRİNCİ HEKAYƏT – Tələsmiş nadan

Həkəmeyn əhvalatından sonra Xariyyət ibni Ramid adlı bir şəxs öz qəbiləsindən ۳۰ nəfərlə (bəni Naciyə) Əli (əleyhissalam)-ın hüzuruna gələrək Həzrətə qarşı etiraz edib dedi: “And olsun Allaha, mən daha sənin yolunla getməyəcək sənin

dalında namaz qılmayacağam. Elə günü sabah səndən ayrılıram." O həmin günün sabahı qaçaraq İslam hökuməti əleyhinə qiyam etsin deyə bir neçə nəfəri də öz ətrafına yığdı. Əli (əleyhissalam) öz əyalətlərinin bütün valilərinə Xariyyət ibni Raşidi axtarmalarını tapşırdı. Bu zaman Həzrətə Xariyyət və yoldaşlarının Mədaində Əli (əleyhissalam)-ın havadarları ilə toqquşması nəticədə beş nəfər ölü verməklə Əhvaz tərəfə qaçaraq orada olan bir qrup oğru və kafirləri özlərinə qoşması, eləcə də öz yağı .əməllərini davam etdirməsi xəbəri yetişdi

Nəhayət Əli (əleyhissalam) Məqəl ibni Qeysi iki min nəfər döyüşçü ilə Əhvaza sarı yola saldı. Məqəl hörmöz dağlarının kənarında Xariyyətin ordusu ilə vuruşaraq yetmiş nəfər bəni Naciyə ٣٠٠ nəfər isə kafirlərdən cəhənnəmə vasil elədi. Qaçmağa cəhd göstərən Xariyyət isə Noman ibni Səhban tərəfindən öldürüldü Məqəl əsir düşən müsəlmanları azad edib ٥٠٠ nəfərə yaxın qeyr müsəlmanı da özü ilə birlikdə Ərdəşir Xuvvə vilayətinə .gətirdi, oradan da qələbə xəbərini məktub vasitəsilə Əli (əleyhissalam)-a çatdırdı

Müsqələt ibni Hücəyrə Şəybani Əli (əleyhissalam) tərəfindən Ərdəmir Xuvvənin valisi təyin edilmişdi. Əsirlər onun hüzurunda ağlayaraq azad olunmalarını ondan xahiş .etdilər

Bir çox danışıqlardan sonra əsirləri ondan beş yüz min dirhəmə alaraq bu məbləği İmam üçün göndərməyinə daha sonra əsirləri azad edəcəyinə söz verdi. Onun İmam üçün iki yüz min dirhəm məbləğində pul göndərməyə imkanı olmadığından Şama .qaçaraq Müaviyəyə qoşuldu

Bəli, o, tələsmək və nadanlığı üzündən əks inqilabçıya çevrildi. Əgər Əli (əleyhissalam)-ın hüzuruna gəlib əhvalatı olduğu kimi o Həzrətə desəydi, İmam Əli (əleyhissalam) onu .mütləq bağışlardı

:Həzrət onun barəsində belə buyurmuşdu

Allah Müsqələnin üzünü qara eləsin, o böyük şəxsiyyətlərin əməlini qulların azad olunmasını yerinə yetirdi, lakin qul kimi də qaçdı. Hələ yaxşı işinə görə onu tərifləyənlərin (yəni qulların alınması və onların azad edilməsi) mədhi sona .yetişməmişdi ki, öz qaçışı ilə özünü danmaq və məlamətə düçar etdi

Əgər o, qaçmayıb müqavimət göstərsəydi hər nəyi olsaydı, biz ondan qəbul edərdik“ ”.və öz borcunu ödəyənə kimi onun üçün güzəşt edərdik

Lakin onun özü bu barədə qardaşı Nəimə belə yazmışdı: Müaviyə ilə sənin barəndə söhbət etmişəm Müaviyə sənə ehsan edib vəzifə verəcək, o, bunu mənə və”də !.veribdir

Bu məktub sənə çatan kimi Şama gəl və mənə qovuş. Doğrudan da nifrin olsun belə .insanlara ki, Əli (əleyhissalam) da onlara nifrin etmişdir

**!İYİRMİ İKİNCİ HEKAYƏT – Gələcəkdən xəbər**

:Bir gün Əli (əleyhissalam) Kufə şəhərinə xitab edib buyurdu

Ey Kufə! Səni xoşagəlməz hadisələrin ayaqları altında tapdanan və nə kimi bəla .yüklərinin çiynindən asılaraq vəhşətli hadisələrlə qarşılaşacağını görürəm

Mən yaxşı bilirəm ki, hər məğrur zalım sənə qarşı sui-qəsd edər və nəticədə Allah onu“ ”.giriftarlığa düçar edib qatil əlində qətlə yetirər

Bu sözlər Kufə və Nəcəf Əşrəf torpağının fəzilətini bəyan etməklə yanaşı həm də Kufənin gələcəkdə yağı tərəfindən ağır hadisə və zülmlərə məruz qalacağını göstərir, lakin zalımların öz cəzalarına çatması çox çəkməyəcəkdir Əli (əleyhissalam)-ın :buyurduğu kimi

Kufəyə böyük bəla nazil oldu necə ki, Ziyad ibni Əbih və oğlu Übeydullah ibni Ziyad eləcə də Məs”əb ibni Zübeyr ilə Yəzid Mühləb və s... təki adamlar zəhərli ölüm oxlarına tuş oldular. Nümunə olaraq Ziyad ibni Əbihin Kufəyə hücum etməsini və Kufə camaatının da məscidə yığılmasını misal göstərmək olar ki, Əli (əleyhissalam)-ı təhqir .etmək məqsədi ora ilə toplaşmışdılar

Bir azdan Həzrətin gözətçisi məscidə gələrək onun xəstəliyə mübtəla olmasını elan :edib dedi

.Bu gün əmir gəlməyəcəkdir

### **İYİRMİ ÜÇÜNCÜ HEKAYƏT – Səfərbərlik fərmanı**

Zamanın çarxı hərəkətdə idi. Belə ki, ۳۶-cı hicri ilinin şəvval ayının beşi yetişdikdə xəbər çıxdı ki, təcavüzkar Müaviyə ordu toplamağa başlamış və Əli (əleyhissalam)-ın nəzarəti altında olan ölkələrə hücum etməyi planlaşdırmışdı. İmam Əli (əleyhissalam) təcavüzkarları məğlub etməkdən ötrü silahlanmış ordu hazır etdi. Həzrət bu ordunu .Nüxəylə də yerləşdirdi

İmam Əli (əleyhissalam) Kufədən çıxdı, Nüxəylə qərargahına sarı yollanaraq orada səfərbərliyə dair çıxış etdi. Çıxışın əvvəlində Allaha həmd və səna etdikdən sonra belə :buyurdu

Agah olun! Mən öz ordumun qabaqcıllarını döyüş meydanına göndərmiş və onlara fərman vermişəm ki, Fərat çayı sahilində sonrakı əmrim onlara çatana kimi düşərgə .salsınlar

Belə səlah bilirəm ki, sudan keçib Dəclə kənarındakı müsəlmanlardan kömək istəyəm. Təki ordu bir az da möhkəmlənsin. Nəticədə isə düşmən özünün hər tərəfdən .mühasirə olunduğunu görüb məğlubiyyətini hiss etsin

Əli (əleyhissalam)-ın təchiz olunmuş ordusu Həzrətlə birlikdə Nüxəylədən Siffeynə tərəf hərəkət edərək (Sasani şahlarının paytaxtı) Mədainə yetişdilər. Müxtəlif qəsr və talar xərabələrini müşahidə etdikləri vaxt qəflətən çürümüş bir kəllə Həzrət Əli :(əleyhissalam)-ın gözünə sataşdı və adamlarından birinə buyurdu

Onu götür mənimlə gəl. Sonra Əli (əleyhissalam) Mədain qəsrinin məşhur eyvanına gəlib orada əyləşdi və bir ləyən istədi. Ləyənə bir qədər su tökdükdən sonra kəlləni :gətirənə buyurdu

Kəlləni teştin ortasına qoy. O da Həzrətin buyurduğunu yerinə yetirərək kəlləni ləyənin ortasına qoydu. Əli (əleyhissalam) cümcüməyə xitab edib buyurdu: “Ey kəllə! Səni and ”?verirəm söylə ki, mən kiməm və sən kimsən

Kəllə dilə gəlib belə dedi: “Sən Möminlər ağası, Seyyidi-Övsiya və təqvalıların rəhbərisən. Mən isə Allahın kənizinin oğlu Kəsra Ənuşirəvanam Əli (əleyhissalam) ona ?buyurdu: İndi halın necədir

:Kəllə bir cavab söylədi ki, xülasəsi budur

Mən əlimin altında olanlara qarşı mehriban olsamda, ancaq Məcus dinində idim.“ Rəyasət və şahlığın göz qamaşdırıcıları məni iman və həqiqi dindən geri qoydu. Budur behiştdən məhrumam, cəhənnəmə giriftar olmuşam. Lakin rəiyyətlə xoşrəftar olduğuma görə cəhənnəm odundan amandayam həsrəta! Əgər mən də vaxtında iman gətirsəydim səninlə olardım, ey Muhəmməd səlləllahu əleyhi və alihi və səlləm .xanədanının sərvəri və ey möminlərin ağası

Kəllənin sözləri o qədər can yandırıcı idi ki, oradakıların hamısı ucadan ağlamağa

.başladılar

Ümidimiz budur ki, bu sərgüzəşti oxumaqla hələ ölüm sorağımıza gəlməmiş özümüzü Həzrət Əli (əleyhissalam)-ın həqiqi ardıcıllarından bilək. Qoy öləndən sonra va .həsrətamız göylərə yüksəlməsin

## İYİRMİ DÖRDÜNCÜ HEKAYƏT – İzzətli ölümün zillətli ölümdən üstünlüyü

İmam Əli (əleyhissalam) öz ordusu ilə Müaviyə qoşununu məğlub etməkdən ötrü Kufədən çıxdı Müaviyə ordusu da ۵۸ min nəfərlik döyüşçü ilə Siffeyn torpağına yetişərək ilk növbədə Fərat su yolunu (yeganə məhəll idi su götürmək üçün) işğal edib tutdu. Əbul Ə"vər Əsləmini də qırx min nəfərlə həmin su yolunu qorumaqdan ötrü ora göndərdi. Beləliklə su yolu Əli

əleyhissalam)-ın ordusunun üzünə bağlandı. Əmr As Müaviyənin bu işini xoşlamayıb) ona dedi: Əli (əleyhissalam) elə bir adam deyil ki, siz su içib sirab olasınız, lakin o susuz .qalsın

Əli bura başqa bir hədəf üçün gəlmişdir. Lakin Müaviyə Əmr Asın sözünə qulaq asmayıb su götürülməsini qadağan etdi

Fəratın tutulması xəbərini Əli (əleyhissalam)-a çatdırdıqda Həzrət Səsət ibni Suhanini çağıraraq onu Müaviyənin yanına göndərdi ki, ona desin biz söhbət və hüccəti tamam etməzdən qabaq müharibəyə başlamırıq və su yolunun sən tərəfdən bağlanması isə .müharibə elan etmək üçün ilk tutarlı bir dəlildir

Səsəə İmamın sifarişini Müaviyəyə çatdırdıqda Müaviyə öz əshabı ilə məşvərət etdi. Vəlid ibni Üqbə ilə Abdullah ibni Səid dedilər: "Suyu onların üzünə mütləq bağlamaq lazımdır ki, susuzluqdan ölsünlər." Müaviyə də bu fikirlə razılaşdı. Bu zaman Əbul .Ə"vərə su yolundan tamamilə müvazib olmaları sifarişini göndərdi

Bu vaxt Həzrət Əli (əleyhissalam) öz ordusu üçün aşağıdakı mövzuda bir xütbə !buyurdu: Ey Camaat

Müaviyənin ordusu su yolunu bağlamaqla sizə müharibə elan etmişdir. İndi siz iki yol ayrıcındasınız, ya zilləti qəbul etməli ya da qılınclarınızı o cinayətkarların qanı ilə .bulaşdırmalısınız

:Bu zaman özünün çox dərin və məşhur cümləsini buyurdu

Əgər məğlub olub onların önündə diz çöksəniz, alçaq və zillətli ölümü qəbul etmisiniz, yox əgər bu yolda iftixar və izzətlə can versəniz, əbədi həyata qovuşacaqsınız. Bilin ki, Müaviyə bir qrup günahkar, yoldan azmış və qara qəlbliləri döyüş meydanına gətirərək həqiqəti onlardan gizlətmişdir ta bu bəxti dönmüşlər öz boğazlarını sizin .ölüm saçan zizələrinizə tuş etsinlər

İmamın bu cəzzab və çox mənalı sözlərinin müqabilində əsgərlər özlərinin bu döyüşə hazır olduqlarını bildirdilər. Daha sonra dörd min nəfər qoşun Malik Əştərin başçılığı altında cəbhəyə sarı göndərildi. İmamın özü də qalan ordu ilə hərəkət etdi. Su yolunun

kənarında şiddətli döyüş başladı. Nəticədə Müaviyə ordusunun minlərlə nəfəri əldən .verməklə geri çəkildi və Əli (əleyhissalam)-ın ordusu su yolunu tutdu

Bu zaman Əli (əleyhissalam)-ın əshabı Həzrətə gəl biz də suyu Müaviyə ordusu üzünə balğlayaq deyə təklif etdikdə İmam Əli (əleyhissalam) buyrudu: “Yox qoyun sudan ”.istifadə etməkdə azad olsunlar. Biz nadanların işini görməyəcəyik

Sizin vəzifəniz İslam və Quranı düşmənə anlatmaqdan ibarətdir ki, onları düz yola hidayət və dəvət edəsiniz . Əgər qəbul etdilər ki, heç, əks halda Allahın istəyi ilə qılıncla ”.onlara layiqincə cavab verəcəyik

Müaviyə ordusu sudan istifadə etməkdə azad olduqlarını bildikdə su götürmək üçün !dəstə dəstə Fərat çayına tərəf axışdılar

Bəli İmam Əli (əleyhissalam) hətta bu cür vəziyyətdə belə mərdlik və ülvi məqamından .çıxmırdı və çıxmadıda

**İYİRMİ BEŞİNCİ HEKAYƏT – Şücaət hədəfi**

səh:۳۲

İmam Əli (əleyhissalam) öz ordusu ilə Fəratın su yolunu düşmən əlindən alıb onu dost .və düşmənin istifadəsi üçün azad etdikdən sonra bir müddət müharibəni dayandırdı

Bu dayanış ordu arasında bir zəmzəməni yaranmasına səbəb oldu ki, niyə Əli ?(əleyhissalam) vuruş əmri vermir

:Bu sualın cavabını İmamdan soruşduqda Həzrət belə cavab verdi

?Bu barədə əsgərlərin öz sözü nədir

Ərz olundu: Bəziləri Əli (əleyhissalam) ölüm qorxusundan cihad əmri vermir, bəziləri isə İmamın Şam ordusu ilə müharibədə (şübhəsi) var deyə söyləyirlər. Həzrət Əli (əleyhissalam) buyurdu: Burada nə qorxu var, nə də şəkk-şübhə. Sonra mətləbin daha :da aydınlaşması üçün dedi

Müharibə hədəf üçün körpü olmalıdır, nəinki hədəf müharibəyə qurban verilsin. Daha :sonra bu xütbəni buyurdu

And olsun Allaha mənim ölümə sarı getməyimdən, yaxud ölümün mənə tərəf gəlməsindən zərrəcə qorxum yoxdur. Amma Şamlılarla müharibə etməyimdə şəkk-şübhə olduğuna gəldikdə isə and olsun Allaha ki, əgər hər gün müharibəni təxirə salıramsa arzum budur ki, bir qrup camaat hidayət olunsun. Bəlkə, zülmətlər içində mənim nurumu görüb inhirafliqdan nicat tapsınlar. Bu mənim üçün müharibədən ya onların öldürülməsindən daha yaxşıdır. Burada Əli (əleyhissalam)-ın şücaət yüksəkliyində öz hədəfini xalqın necə hidayət olmasında bəyan etdiyini və şücaətlə yanaşı özünün səbr və dözümünü müşahidə edirik. Belə ki, bu barədə Həzrətin özü belə buyurur: Xeybər müharibəsində Rəsulullah səlləllahu əleyhi və alihi və səlləm :mənə buyurdu

Əgər Allah sənin vasitənlə bir nəfəri hidayət edərsə, sənin üçün günəşin bir şeyə“ ”.saçmasından daha yaxşıdır

Digər rəvayətdə gəlibdir ki, Siffeyn müharibəsi cəbhəsində İmam Əli (əleyhissalam) zireh geymədən meydana atıldıqda oğlu İmam Həsən (əleyhissalam) atasına ərz etdi: .Bu cür ehtiyatsızlıq müharibə qanunlarının əleyhinədir

:İmam buyurdu

Oğlum, atanın qorxusu yoxdur ki, özü ölümə varid olsun, ya ölüm gəlib onu tapsın.” “

Yenə də Əli (əleyhissalam) Peyğəmbər səlləllahu əleyhi və alihi və sələmin vəfatından :və xilafət söhbəti ortaya atıldıqdan sonra buyumuşdu

Əgər söz danışsam (və haqqımı tələb etsəm) deyərlər rəyasət hərisidir. Yox, əgər sussam, ölümdən qorxur deyəcəklər. And olsun Allaha Əbu Talib oğlunun ölümə olan .həvəsi süd əmər uşağın ana döşünə olan istəyindən daha artıqdır

Bəsrə şəhəri Həzrət Əli (əleyhissalam)-ın xilafəti altında olan İslami ölkələrin həssas vilayətlərindən biri hesab olunurdu. Belə ki, strateji baxımdan müxtəlif şəhərlərin mərkəzlə olan qarşılıqlı əlaqə korpusu hesab olunurdu. Öz ədalət sərhədlərinin genişləndirilməsinə çalışan Müaviyə bu dəfə Abdullah ibni Hüzərmi bir dəstə adamla Bəsrəni işğal etməyə yolladı. O vaxt Ziyad ibni Übeydə Əli (əleyhissalam)-ın Bəsrədəki .valisi gəlib özünün cürbə-cür fırıldaqları ilə adamları aldatdı

Yavaş-yavaş işi o yerə çatdırdı ki, Bəsrə camaatınnın çoxu onunla beyət edib .Müaviyənin havadarı oldular

Ə"yun ibni Səbiy"ə adlı bir şəxs öz arzusu ilə İmam Əli (əleyhissalam)-dan Bəsrəyə .getməsinə və orada olan ibni Hüzrəminin qoşununu darmadağın etməsinə icazə istədi

Həzrət ona icazə verdikdən sonra Ə"yun Bəsrəyə gəldi, lakin müxalif qüvvələr onu .güdərək bir gecə onu yatmış yerdə öz yatağındanca öldürdülər

Ziyad məktub vasitəsilə Əli (əleyhissalam)-a məlumat verib ondan ibni Hozərmi nin şərrinin qarşısını almaq üçün Cariyət ibni Qudaməni Bəsrəyə göndərməsini xahiş etdi. Cariyə şücaətli qorxmaz bir şəxs idi, eləcə də camaat içində böyük nüfuz sahibi idi. İmam Əli (əleyhissalam) öz ordusunun səfərbərliyi ilə əlaqədar aşağıdakı məzmunda :bir çıxış etdi ki, həmin çıxışın xülasəsi budur

Biz Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm hüzurunda elə ixlasla fədakarlıq göstərirdik ki, hətta bu yolda öz ata, övlad, qardaş və əmilərimizi belə qurban verməyə hazır idik. Günbəgün də Rəsulullah səlləllahu əleyhi və alihi və səlləmin bərabərində iman və itaətsizlik artmaqda idi. Hər dəqiqə bu yolda daha da sabit qədəm olurduq, .bəzən biz düşmənə, bəzən də düşmən bizə qalib gəlirdi

Allah bizim ixlas və düzlüyümüzü gördükdə zilləti düşmənlərimizə nazil edib bizi qalib“ ”.etdi. Belə ki, ölkələrdə İslam genişlənib möhkəmləndi

İmam Əli (əleyhissalam) bu sözü ilə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm əshabının fədakarlığını nümunə və ülgü kimi tanıtdı. Çıxışının sonunda isə laqeyd və

süst olanları qəflət yuxusundan oyatmaq üçün belə buyurdu: “And olsun öz canıma, əgər biz düşmənlə vuruşmaqda sizin təki olsaydıq nə din əsası möhkəmlənər, nə də ”.din ağacından bir budaq göyərərdi

## İYİRMİ YEDDİNCİ HEKAYƏT – Gələcəkdən xəbər və ifşa

səh:۳۴

İmam Əli (əleyhissalam) xalqın diqqətini doğru rəhbərliyə cəlb edib fasid rəhbərlərdən uzaqlaşdırmaq üçün bəzi vaxtlar gələcəkdən belə xəbər verirdi. Bir gün belə :xəbərlərin birində buyurdu

Bilin ki, məndən sonra tezliklə açıq boğaz və yekə qarın bir kəs sizə rəhbər olacaqdır ki, əlinə hər nə düşərsə hərisliklə udacaq və tapılmayanların dalınca adam saldırıb onları .öldürəcəkdir

.Baxmayaraq ki, sizdə bu qüdrət və himmətin mümkün olmasını bilirəm

Sonra buyurdu: Agah olun ki, tezliklə bu şəxs sizi mənə qarşı bizar və əleyhimə pis danışmağa vadar edəcəkdir. Pisliyimə danışmağı məcburi surətdə sizlərə vadar etdikdə sizə icazə verirəm. Çünki məhz bu pisliyimə daşışıqlar mənim məqamımın daha yüksəlişinə və dərəcələrimin daha da artmasına səbəb olar. Sizlərə isə onun ölüm caynağından nicat verər. Ancaq bizarlığa gəldikdə isə heç vaxt məndən bizarlıq axtarmayın, çünki mən tövhid fitrəti ilə doğulmuş, iman və mühacirətdə isə hamıdan .irəlidə getmişəm

Amma bu açıq boğaz və yekə qarın kimdir deyə sual etsəniz çox nəzərə çarpır ki, ".“Müaviyə olsun

Ona görə ki, bu saydığım nişanələrin, ən çoxu onda görünübdür. Belə ki, “Nəhcül-bəlağə”nin əksər şərhçiləri də bu fikirdədirlər. Əgər Ziyad ibni Əbih, Həccac ibni Yusif, Müğəyrət ibni Şöbə və s.. kimi adamlar da Müaviyə təki rəftar etsəydilər Müaviyənin dalınca getmək idi. Bilin ki, bid”ətin əsasını qoyan elə Müaviyə özü olubdur. Rəvayətə :gəldikdə isə Müaviyə nə qədər yesəydi yenə yorulmurdu. O deyirdi

Xörək gətirin, doymadım.” Bu barədə İbni Əbil Hədid yazır. Bir çox rəvayətlərdə belə“ :gəlib ki

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm Müaviyənin yanına adam göndərib onu çağırdıqda dedilər ki, Müaviyə yeməklə məşğuldur. İkinci dəfə də həmin cavabı :verdikdə Həzrət onu belə nifrin etdi

İlahi, onun qarnını heç doyurma.” Cahizdən nəql olub ki, bəni Üməyyədən bir çoxları“

Müaviyəyə dedilər: “Sən öz arzuna çatdın, indi bəsdir, daha Əli (əleyhissalam)-ı söyüb :pisliyinə danışmaqdan əl çək, Müaviyə isə onların cavabında belə dedi

And olsun Allaha, yox, heç vaxt! Gərəkdir ki, uşaqlar bu xasiyyətlə tərbiyə tapıb“ ”.yaşlılar da bu xasiyyətlə qocalsınlar

Bu xəbər Əli (əleyhissalam)-ın qeybi xəbərlərindən biri idi. Bu cür xəbərlərdən çox .olubdur

Müaviyənin Hücr ibni Ədi və yaxın adamları ilə olan macərası və oğlu Yezid (ibni Ziyadın) oğlunun nümayəndəsi Meysəm Təmmar və Həccac ibni Səqəfinin Qənbərə, .Kumeyl və Səid ibni Cubəyr və s... əhvalatı idi

## İYİRMİ SƏKKİZİNCİ HEKAYƏT – Nəhrəvan xəvariclərı ilə şiddətli müharibə

Onlar mane olub düşmən dəyirmanına su tökdülər. Bu din oğruları, şüarı ilə Əli (əleyhissalam)-ı müşrik adlandırdılar. İmam bu işin qeyri hərbi yolla bitib tamam olmasına nə qədər səy göstərdisə də heç bir fayda vermədi. Onlar isə Həzrətlə olan müxalifətlərini davam etdirməkdə idilər. Belə ki, dörd min nəfərə yaxın xəvaric Abdullah ibni Vəhəb ilə beyət edib Mədainə sarı irəliləyib Əli (əleyhissalam)-ın qoşun komaniri Abdullah ibni Xəbbabi şəhadətə yetirdilər və onu şəhid etdikdən sonra hamilə olan arvadının qarnını yardılar. Beləliklə Əli (əleyhissalam)-a qarşı müharibə elan .etdilər

Bu vaxt Əli (əleyhissalam)-da öz ordusu ilə Nəhrəvan torpağına gələrək Xəvaric qoşununun bərabərində durdu. Həzrətin nəsihətləri o kor ürək sahiblərinə əsla əsər etmədi. Üç dəfə Əli (əleyhissalam)-ın ordusunu nizə yağışına basdılar. Hər dəfə Həzrətin əshabı Əli (əleyhissalam)-dan onlara qarşı döyüş icazəsi istədilərsə də Həzrət bu icazəni vermədi. Axırda onlar Əli (əleyhissalam)-ın yaxın köməkçilərindən birini :öldürdükdə Həzrət Əli (əleyhissalam) buyurdu

".Allahu Əkbər, indi bunlarla müharibə etmək olar“

Xəvaric biabır surətdə məğlub oldu. Onlardan yalnız ٩ nəfəri sağ qalaraq qaçdı. Əli (əleyhissalam)-ın ordusundan ٩ nəfər şəhadətə yetişdi. Xəvaric əhvalatına “Nəhcül-bəlağə”nin müxtəlif xütbələrində o cümlədən ٥٨, ٥٩, ٦٠ və ١٢٢ və s... xütbələrində işarə .olunmuşdur. Bu rabitədə baş vermiş daha iki hadisə də maraqlıdır

Əli (əleyhissalam) Xəvariclə müharibəyə hazır olduqda əshabdan o Həzrətə belə :dedilər

Xəvaric qoşunu Nəhrəvan körpüsündən keçdi. İmam isə onların cavabında belə :buyurdu

Onların qətligahı bu tərəfdə çay qırağındadır. And olsun Allaha ki, Xəvaricdən hətta on .nəfərdən belə sağ qalmayacaq sizdən isə hətta on nəfər də ölməyəcək

Əli (əleyhissalam) qabacadan xəbər verdiyi kimi də oldu, ٩ nəfərdən başqa Xəvaricdən bir nəfər də olsun sağ qalmadı və bu ٩ nəfər də qaçaraq müxtəlif şəhərlərdə

pərakəndə düşdülər. Bu da İmam Əli (əleyhissalam)-ın qeybi xəbərlərindəndir ki, həm şiə, həm də sünnü tarixçiləri bunu öz kitablarında qeyd etmişlər. Dəfələrlə İmam Əli (əleyhissalam)-ı ölüm ilə hədələməklərinə baxmayaraq o Həzrət zərrə qədər də olmuş .olsa onlardan çəkinməmişdi

:Qəhrəmanlar qəhrəmanı Əli (əleyhissalam) bu təhdidlərin cavabında buyurmuşdu

Allah mənim imanım və din qalxanımı poladdan düzəldibdir (vəhşətim yoxdur).“ ”.Ömrümün son günü çatsa o gündə nə nizə xəta edər, nə də yara sağalar

Bu mətləbdən başa düşürük ki, İmam Əli (əleyhissalam) özü bilə-bilə bu din oğruları və nadan şəxslər olan Xəvariclərin önündə duraraq onların təhdidlərindən heç vaxt .qorxmadı

Öz polad iradəsi ilə Allaha müxlisanə təvəkkül edərək öz yolunu başa vurdu. Beləliklə, o Həzrət öz sadiq adamlarına şəhamət və dilavərlik dərsi öyrədib xəbərdarlıq etdi ki, hər vaxt din maskası altında din əsasına zərbə vuranları gördsəniz onlara aman .verməyin

**İYİRMİ DOQQUZUNCU HEKAYƏT – Müharibədən qaçmaq**

Artıq Siffeyn müharibəsinin alovları şölələnmişdi. Bu müharibənin başlan-ğıcında ya Læylətül-Həririn bərk soyuq bir gecəsində Əli (əleyhissalam) öz köməkçilərinə şur-əngiz bir xütbə buyurdu. Bu xütbədə müharibə qanunları səfərbərlik və ruhiyyə :tapılması üçün lazım olan amillərdən söhbət açıldı

Bilin ki, indi cihadda Allah qarşısında Allah elçisinin əmisi oğlu ilə birsiniz. Düşmənə" qarşı durmadan amansız həmlələr edin. Qaçmaqdan həya edib utanın. Çünki bu iş (fərarilik) gələcək üçün rüsvayçılıq, qiyamət günündə isə cəhənnəm oduna səbəb olar. :(Xütbənin sonunda bu ayəni ("Muhəmməd" surəsinin ٣٥-ci ayəsini) oxudu

Bilin ki, siz üstünsünüz və Allah sizinlədir və əməl mükafatınızdan heç bir şey" əksilməz." Bu tərtiblə Əli (əleyhissalam) öz ardıcıllarını tarix boyu cinayətkarlarla müharibəyə dəvət etdi. Müharibədən qaçmağı isə insan ətəyindəki həya, ar ləkəsi kimi .bildirib axirətdə isə yanar od sandı

**OTUZUNCU HEKAYƏT – Dəlillərin rədd edilməsi**

Allah elçisinin vəfatından sonra bir qrup adam bəzilərinin təhriki sayəsində Peyğəmbərin yerinə canişin təyin etməkdən ötrü Səqifeyi bəni Saidədə yığışdı. Bu zaman Əli (əleyhissalam) evdə idi, Səqifə xəbərlərini eşitdikdə yaxın adamlarından soruşdu o Ənsar (Mədinə müsəlmanları) nə dedilər? Ərz olundu: Onlar dedilər: Həm bizim, həm də sizin aranızdan (Mühacirlər) bir nəfər əmir seçilsin. İmam Əli (əleyhissalam) buyurdu: Niyə ənsarın təklifi müqabilində bu mətləbə qarşı bir tədbir

tömkmədiniz? Məgər eşitməmişdinizmi ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onların ehtiramı barədə buyurub: Ənsarın yaxşıları ilə yaxşı rəftar edin, onların .arasındakı pis adamları isə bağışlayın

:Dedilər: Biz bu sözlə ənsarı necə məhkum edəydik?! Buyurdu

Əgər hökumət və əmirlik Ənsarın arasında olsaydı onların mühacirlərə tövsiyə və" sifarişinin mənası olmazdı." Çünki, camaat arasında bu bir qaydadır ki, keçmiş rəisin sifarişini təzə rəisə edərlər. Buna görə də Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm mühacirlər arasında hakimin olmasını müsəlləm fərz edibdir. Sonra buyurdu: ".Qüreyşin fikri bu barədə nə idi? Ərz olundu: Onlar dedilər: "Biz risalət ağacındanıq

Çünki, Qüreyş tayfası və Peğəmbər səlləllahu əleyhi və alihi və səlləm ikisi bir qohum olub əsilləri bir nəfərə Nəzr ibni Kənanə qayıdır. Buna görə də dəlil gətirdilər ki, biz nəsəb və nəsl baxımından Peğəmbərə səlləllahu əleyhi və alihi və səlləm yaxın .olduğumuz üçün əmir də bizim aramızdan seçilməlidir

:Həzrət Əli (əleyhissalam) buyurdu

".Ağacı dəlil göstərib meyvəsini korladılar"

Yəni ağacdan hədəf onu meyvəsidir, mühacirlər və Qüreyşlilər, ağacın meyvəsi mən .olduğum halda məni unutmuşlar. Ağaca təkyə edib dəlil gətirirlər

Meyvəyə nəzər salmayan bir şəxs külli qaydada gərək ağacın özünə də diqqət .yetirməsin

Bu tərtiblə İmam Əli (əleyhissalam) hər iki qrupun dəlillərini (Ənsar və mühacirlər) .rədd edib üstünlüyünü sübuta yetirdi

## OTUZ BİRİNCİ HEKAYƏT – Mərvanın əsirliyi

Mərvan ibni Həkəm İslam tarixi başlanğıcında yaşamış ən çirkin və alçaq şəxsiyyətlərdən idi ki, hələ böyük islam Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləm öz vaxtında onu və atasını Mədinədən sürgün etmişdi. Mərvan və atası Tərid ibni Tərid və Münafiq ibni Münafiq və lə"in ibni Lə"in ünvanıyla (sürgün olunmuş atanın sürgün

olunmuşu və Münafiq oğlu Münafiq və Məl”un oğlu Məl”un) deyə yad olunurdular. Osmanın əmisi oğlu sayılan Mərvan Osmandan sonra zahirdə Həzrət Əli (əleyhissalam)-la beyət etməsinə baxmayaraq ilk beyət pozanların başçıları cərgəsində dururdu. O Cəməl müharibəsində Bəsrəyə gələrək düşmən ordusu sıralarına keçib Əli (əleyhissalam)-ın qoşununun əleyhinə vuruşurdu. Elə həmin müharibədə Əli (əleyhissalam) ordusu tərəfindən əsir alındıqda İmam Həsən və İmam Hüseyn (əleyhissalam) onun azadlığı

üçün atalarından xahiş etdilər. İmam Əli (əleyhissalam) da onu azad etdi. Həsən və Hüseyn (əleyhissalam) atalarından soruşdular: “Mərvan səninlə beyət edəcək.” İmam :cavabında buyurdu

Məgər o, Osman öldürüləndən sonra mənimlə beyət etmədimi? (ancaq beyətini“ .(sındırdı

Mənim onun beyətinə ehtiyacım yoxdur. Onu əli yəhudinin əli kimidir. (hiylə və iki ”.üzlülüyə adət edibdir) əgər Əli ilə beyət etsə, öz arxası ilə beyəti sındırmağa çalışar

:Sonra İmam gələcək üç mövzuda xəbər verib buyurdu ki; “Agah olun Mərvan

Gələcəkdə qısa hökumətlik edəcək ki, bunun da vaxtı bir itin öz burnunu dili ilə-١ .təmizləyən Müddətə qədərdir

.O, dörd qoçların atasıdır-٢

.Müsəlman xalqı onun özü və oğlanlarının əlindən qan ağlayacaqdır-٣

Hadisələr Əli (əleyhissalam)-ın xəbər verdiyi kimi baş verdi. O, Əməvilərin ۴-cü xəlifəsi ünvanıyla Müaviyət ibni Yeziddən sonra xilafət kürsüsünə əyləşdi. Mərvanın xilafət müddəti dörd ay on gün çəkdi. Onun Əbdül Məlik Boşr Məhəmməd və Əbdül Əziz adında ۴ oğlu var idi ki, ١-ci si Mərvandan sonra xilafətə yetişdi. ٢-cisi İraqın hakimi seçildi. ٣-cüsü Əlcəzirənin, və ۴-cüsü isə Misir hakimi təyin oldu. Bu beş nəfər .müsəlmanları öz zülm çəkmələri altında var gücləri ilə əzdilər

### OTUZ İKİNCİ HEKAYƏT – Ulduz falının rədd edilməsi

Həzrət Əli (əleyhissalam) öz ordusu ilə birlikdə Xəvariclə vuruşmaqdan ötrü Nəhrəvana tərəf hərəkət etməyə hazırlaşdığı zaman Əfif ibni Qeys Əş”əsin qardaşı (münafiq dəstə başçısı) Əli (əleyhissalam)-ın hüzuruna gəlib dedi: Bu vaxt hərəkət edib qələbəyə çatmamağından ötrü qorxuram, çünki mən bunu sizə Nücum elminin .köməkliyi ilə deyirəm

:İmam onun cavabında buyurdu

Sən fikirləşirsən ki, o, saat ki, onda hərəkət etmək narahatlığa səbəb olacaq, ondan !?xəbərdarsan? Edə bilərsənmi onun təhlükəsini hərəkət edənə kimi xəbər verəsən

Hər kim bu sözdə səni təsdiq etsə Quranı təkzib etmiş, öz istədiyinə çatmaqda və bəyənilməz işləri dəf etməkdə Allahdan kömək istəməkdən ehtiyacsız olubdur. İstəyirsən Allahın əvəzinə sənə sitayiş etsinlər? Sən, qabaqcadan belə söz deməklə onları zərər və ziyandan hifz edərsən, ey camaat nücum elminin qabaqcadan fikir söyləməyindən uzaq olun, çünki bu iş sizləri kahinliyə (cin və xəbis ruhlar vasitəsilə qeybdən xəbər verməklə) çəkib çıxarar Müncim kahin təki, kahin də sehrbaz kimidir. .Sehrbaz isə kafirdir. Kafir isə odda yanacaq, Allahın adıyla hərəkət edin

Beləliklə də İmam onun döşünə rədd əli çəkib qoymadı ki, camaat bu boş xəyallarla hərəkət və fəaliyyətlərindən uzaqlaşsınlar. Daha sonra isə Həzrət öz ordusu ilə hərəkət edib tam qələbəyə nail oldu və öz əməli ilə sabit etdi ki, münəccimin qabaqcadan fikir söyləməyi düz deyil. Bu mətləbin oxşarı müxtəlif rəvayətlərdə gəlib. O, da budur ki, Əli (əleyhissalam) öz ordusu ilə Həruriyyə tərəf hərəkət etdiyi zaman əshabın arasında özünü münəccim adlanlandıranlardan biri Əli (əleyhissalam)-ın :hüzuruna gəlib dedi

Ey Möminlər ağası! Bu saatda hərəkət etmə, çalış gün batandan üç saat sonra irəli get, əgər indi hərəkətə başlasan bu irəliləməyin sənə və yoldaşlarına şiddətli ziyan .yetirəcək, amma mən deyən vaxtda tərpənsən qalib gəlib hədəfə yetişəcəksən

İmam Əli (əleyhissalam) ona buyurdu: Atımın qarnındakı balanın dişi ya erkək olmasını ?bilə bilərsənmi

.(O dedi: Əgər (nücum elmi üzündən hesablasam bilərəm

İmam ona buyurdu: Əgər bu işində səni bir adam təsdiq etsə, Quranın təkzib etmişdir, :çünki Allah-təala “Loğman” surəsinin ٣٤-cü ayəsində bu barədə belə buyurur

Şübhəsiz qiyamətə aid olan elm və agahlıq, yalnız Allaha məxsusdur. O Allahdır ki,“ ”.həm yağış göndərir və həm də ana bətnində olanlardan xəbərdardır

Sonra buyurdu: (Hətta) Muhəmməd səlləllahu əleyhi və alihi və səlləm belə bir iddianı .ömründə etməmişdi

### OTUZ ÜÇÜNCÜ HEKAYƏT – Yersiz eyb və onun rəddi

Əli (əleyhissalam) öz İmamət və rəhbərlik sahəsində bütün ismətlərə ali səviyyədə .malik idi. O Həzrətin kinli rəqibləri onda heç bir eyib tapa bilməmişdilər

Çünki əgər tapsaydılar o eybi bir neçə dəfə böyüdüb şişirdərdilər ki o Həzrətin ali .şəxsiyyətinə zərbə vursunlar

Bir halda ki, Əli (əleyhissalam) təvazökar və xoş xasiyyət eləcə də çox mehriban idi. O, Həzrətdə özünü bəyənmək ya təkəbbür yox idi həm də tağutlar kimi tuluğa hava

doldurmurdu hətta ən yoxsul adamlarla belə oturub durur onlara bir dost kimi yanaşırdı. Napak olan Əmr As kimi düşmənləri (onun anası iffətsizlik və napaklıqda məşhur idi) Şam camaatı arasında Həzrət Əli (əleyhissalam)-ın zarafatcıl olması şayiəsini yayaraq dedi ki, bu səbəbə görə o, xilafətə layiq deyildir.

İmam Əli (əleyhissalam) bu şayədən xəbərdar olduqda şiddətlə onu təkzib edib buyurdu:

Napak qadının övladından (yəni Əmr As) Şam camaatı arasında mənim zarafət və əhli-!kef olmağımı şayiə etməsi çox təəccüblüdür

Agah olun, And olsun Allaha ki, ölümü xatırlamaq məni zarafatdan saxlayır, amma“ əksinə axirəti unutmaq isə onun (Əmr Asın) vücudunda onun yalançılığına bais ”.olubdur

Beləliklə düşmənin Əli (əleyhissalam)-ın şəxsiyyətini sındırmaq üçün düzəltdiyi körpünü Həzrət özü sındırdı ki, bu da Əli (əleyhissalam)-ın kamal yüksəkliyinə malik .olmasına daha bir tutarlı sübutdur

## OTUZ DÖRDÜNCÜ HEKAYƏT – İmamın qətiyyətli olması

Osman qətlə yetirildikdən sonra camaat Əli (əleyhissalam)-ı xilafətə təyin etmək üçün o Həzrətə beyət etdilər, Əli (əleyhissalam) ilk növbədə hüccəti tamam edərək öz iş metodunu onlara bildirib buyurdu: Məni öz halıma buraxıb başqasının sorağına gedin. Çünki, əgər mən xilafətə gəlsəm, keçmiş qayda-qanunlar büsbütün dəyişiləcəkdir. ...Burada əsaslı (inqilabi) islahatlara ehtiyac vardır

Camaatın onun xilafətə gəlməsi israrını görən Həzrət Əli (əleyhissalam) buyurdu: “Bilin ki, əgər dəvətinizi qəbul etsəm sizinlə öz bildiyim kimi rəftar edəcəyəm. Heç kəsin .sözünə ya məzəmmətinə qulaq asmayacağam

Haqqı qətiyyətlə davam etdirəcəyəm. Bunları dedim ki, indidən biləsiniz, əgər istəsəniz ”.bu şərtlərə əsasən mənimlə beyət edin

Camaat dəstə-dəstə axışıb gələrək o Həzrətlə beyət edirdilər. Elə oradaca bir qrup adamın zahirdə beyət etmələri məlum oldu. Ona görə ki, onların dünya malına olan .hərisliyi İmamın mövqeyi ilə düz gəlmirdi

Tarixdə gəlibdir ki, Həzrətlə ilk beyət edən şəxs Təlhə olmuşdur. Belə ki, onun əli şikəst olduğundan elə həmin əli ilə də beyət etdi. Bu hadisənin şahidi olan bir bədəvi ərəb :belə dedi

.Çolağın əli ilə başlanan bir iş kamala yetməz

Osman və Müaviyənin xilafətləri zamanında İslam ölkəsinin damarı və kökü artıq yavaş-yavaş Bəni-Üməyyə tayfasının çirkin əlinə düşmüşdü. Belə ki, bu şəxslər İslamdan öz nəfsani və əyyaşlıq hədəflərini həyata keçirməkdən ötrü bir körpü təki istifadə edirdilər. Müaviyənin ölümündən sonra Bəni-Üməyyə xilifələri ardıcıl olaraq İslam adı altında böyük İslam ölkələrinə hökmranlıq etmişlər. Möminlər ağası Həzrət :Əli (əleyhissalam) söhbət əsnasında onlara xitabən belə buyrmuşdu

Ey Əməvilər sülaləsi, and olsun Allaha ki, tezliklə bu xilafət cilovunu başqalarının, öz“ ”.düşmənlərinizin əlində körəcəksiniz

İmam Əli (əleyhissalam)-ın qabaqcadan xəbər verdiyi kimi bir müddət ötdükdən sonra tarixdə Bəni-Üməyyə xəlifələrindən heç bir ad və nişan qalmadı. Bəni-Abbas xəlifələrinin hakimiyyəti ilə Bəni-Üməyyənin taxt tacı çevrildi. Mərvan Həmmar bəni Üməyyənin son xəlifəsi, ayağı yanmış it kimi şəhər və biyabanlarda dərbədər olmuşdu ki, bir gecə Abbasilərin birinci xəlifəsi Səffahın məmurları onu bir kənddə mühasirəyə salaraq qarnına bir nizə batırıb cəhənnəmə vasil elədilər. Qəribəliklərdən biri də budur: Mərvanın nökərlərindən biri düşmən yanında onun sirrini faş etdiyinə görə Mərvan oun dilini kəsib pişiyə atmışdı ki, pişik də onu yemişdi. Mərvanın öz başını bədənindən ayıran zaman onun da dilini kəsib kənara atdılar. Nökərin dilini yemiş o pişik cəld sıçrayıb onun dilini də yedi. Südəyf Bəni-Üməyyə əsrində yorulmaz mübariz və böyük ürək sahibi olan şairlərdən idi ki, dəfələrlə onların əzabına düçar olmuşdu. Bir gün o qənimət sayıb Bəni-Üməyyənin də hazır olduğu bir yığıncaqda Səffahın hüzurunda Bəni-Üməyyənin cinayətlərini bir-bir sadalayaraq Kərbəla macərası, eləcə də Yezidin cinayətlərini bir-bir açıb tökdü. Öz vəcdə gətirən və tükürpədici şerlərini də elə həmin məclisdə söylədi. Bu çıxış Səffahı o qədər təhrik etmişdi ki, hətta Bəni-Üməyyənin yerdə qalanlarını ona tapşırdı Sudəyfdə Muxtar kimi Bəni Üməyyədən o qədər öldürdü ki, onların napak qanından böyük göl əmələ gəldi Yerdə qalanını isə duş daşından olan evlərin binası altında yerləşdirərək çayın suyunu həmin evlərə tərəf axıtdırdı nəticədə də evlər onların üstünə uçub məhv oldular. Beləliklə Bəni-Üməyyə tam zillət içində öz dünyəvi cəzalarına çatdılar. Demək olar ki, bu qətldən min nəfərə yaxın murdar .aradan getdi

Təlhə, Zübeyr, Səid İbni As, Vəlid ibni Ötbə, Abdullah və sair kimi baş bilicilər Əli (əleyhissalam)-ın beytül-malı bərabər surətdə bölərək təbəqələr arasında fərq qoymadığına görə bərk narahat idilər. Onların ilk növbədə böyük şur və mövqe ilə beyət etmələrinə baxmayaraq vəziyyəti belə gördükdə beyətlərini sındırıb Əli (əleyhissalam)-ın vücudundan sui istifadə etmək qərarına gəldilər. Belə ki, bunlar Əli (əleyhissalam)-la müxalifət (düşmənçilik) fikrinə düşərək hətta silahlı üsyan etməyi belə planlaşdırdılar. Öz yanlış təsəvvürləri ilə Əli (əleyhissalam)-ı zor və qorxu gücünə .həvəslərinə təslim etmək istədilər

Həzrətin işi o yerə çatdı ki, Əli (əleyhissalam)-ın ən yaxın əshabından olan Əmmar :Yasir və s... kimiləri Əli (əleyhissalam)-ın hüzuruna gəlib belə ərz etdilər

Mümkün qədər hələlik yumuşaqlıq göstərsin, qəbilə başçılarına müəyyən güzəştlər“ edilsin və onların iş başında olmasına ləyaqətləri olmasa da bir müddət iş başında qalmalarına icazə verilsin. Ta Əli (əleyhissalam) hökumət sütunu möhkəmlənib fürsət .ələ gətirdikdən sonra o zaman onlarla haqq əsasında rəftar olunsun

Mömininlər ağası Əli (əleyhissalam) onların cavabında bir söz buyurdu ki, həqiqi cavab :xütbə kimi “Nəhcül-bəlağə”-də dərc olunubdur

Mənim hakimiyyətim altında olanlar, zülm etməyimi mənə göstəriş verirsiniz. Nə var, nə var öz ətrafıma yeni köməkçilər gətirim deyə?! And olsun Allaha, nə qədər dünya vardır, nə qədər ki, bir ulduz başqa bir ulduzun dalınca hərəkət edir bu işi görməyəcəyəm. Əgər öz malım olsaydı, onu bərabər surətdə bölərdim qalmış ola bu .mala ki, Allah malıdır

Belə bəxşiş bağışlayanı dünyada qaldırıb nicat günündə aşağı çəkir, bəndə qarşısında .onu hörmətli etsə də Allaha dərgahında xar edir

### OTUZ YEDDİNCİ HEKAYƏT – təxribatçı və qanlı şüar

Xəvaric Əli (əleyhissalam) ordusunun vəhdətinə və eləcə də onun möhkəmlənməsinə böyük zərbə vurmuşdular. Belə ki, onların bu zərbəsi daxili müharibənin əmələ .gəlməsinə bais olmuşdur

Nəhayət Əli (əleyhissalam) Nəhrəvan çölü müharibəsində onları məğlubiyyətə uğratdı. Bu yolunu azmışların gözəl və aldadıcı zahirləri olduğundan bu şüarın maskası altında Əli (əleyhissalam)-ı və köməkçilərini kənarlaşdıraraq özlərinin səhnəyə gəlməsini arzulayırdılar. Həzrət Əli (əleyhissalam) bir gün İraq müsəlmanlarına söhbət zamanı :buyurdu

Ey çox olan camaat, birləşin ki, Allahın əli camaatladır və pənahəndəlikdən həzər“ ”.edin

La hökmə illa lillah” (hökumət yalnız Allaha məxsusdur) şüarı Xəvaric əlində bəhanə“ :olub müsəlmanlara ziyan verdiyi halda Həzrət Əli (əleyhissalam) buyurdu

Agah olun! hər kim bu şüarı bir də dilinə (pozucu və parçalayıcı) gətirsə hətta“ ”.əmmamənin altında olmuş olsa belə onu öldürün

Bir gün Xəvaricdən olan Burc ibni Mushir Taiy adlı bir şair İmam Əli (əleyhissalam) eşitsin deyə uca səslə həmin şüarı təkrar etdi: La hökmə illa lillah (hökumət Allaha .(məxsusdur, sənə yox

İmam ona buyurdu: Sus! Üzün qara olsun ey dili sınıq. And olsun Allaha, haqq aşkar oldu, lazım olan vaxtda söz söyləmədin, səsin köksündə boğulmuş, guya acizlik və .zəiflik başdan-başa sənin vücudunu əhatə etmişdi

İndi isə budur, öz yonulmamış səsini cəsarətlə yüksəldibsən. Keçi buynuzu kimi peyda .olub öz batil və pozucu səsini hulqumundan qaldırıbsan

Bu minvalla Əli (əleyhissalam) bütün din şüarı altında çıxış edib dinlə müharibəyə girənlərə aldanmalarını öyrətdi, bəli, hər vaxt ən gözəl şüarımız belə əgər zalım qan içən və münafiqlərin əlində ələmə çevrilərsə nəinki həmin şüarın heç bir zərəri olmayıb, əksinə şüar deyənin qanının da qiyməti yoxdur. Lazım gəldikdə şüarı deyəni öldürmək də olar. Bir halda ki, bu şüar müsəlmanların dağılaraq inhirafına bais olacaqsa onda onun qarşısını almaq məsləhətdir. “Nəhcül-bəlağə”nin ۴۰-cı xütbəsində qeyd olunduğu kimi İmam Əli (əleyhissalam) buyurmuşdu: Bu şüar haqq sözüdür ki, !!!ondan batil işlər üçün istifadə edilir. Biz də deyirik: Bəli Allahın fərmanı hakim olmalıdır

## OTUZ SƏKKİZİNCİ HEKAYƏT – Zənci Əmirlərin cinayətlərindən xəbəri

Tarixin ən böyük qan içən fasidlərindən sayılan Əli İbni Muhəmməd Vərzənini Sahibul zənc yəni Zəncilərin əmiri adı ilə məşhur idi. O Rey mülkünün Vərzənin adlı kəndində dünyaya gəlmiş, ۲۵۵ hicri qəməri tarixində Əl-möhtədi Billahın (Abbasilərin ۱۴-cü ”.xəlifəsi) xilafəti zamanı üsyana qalxmışdı

O yalandan özünün bəni Haşim və İmam Səccad (əleyhissalam)-ın nəvələrindən olduğunu aşağıdakı surətdə iddia edirdi: Əli ibni Muhəmməd ibni İsa ibni Zeyd ibni Əli .ibni Hüseyn

Bu iddia bəni Haşimin qəbiləsinə bağlı olan camaatı öz ətrafına toplamaqdan ötrü idi, .lakin cinayətləri onun bəni Haşimdən olmamasını sübut edir

Əlavə olaraq müxtəlif rəvayətlərdə İmamlar onun iddasını rədd ediblər: O, cümlədən: :İmam Həsən Əsgəri (əleyhissalam) bir söhbət zamanı buyurmuşdu

".Sahib Zənc" biz Əhli-beytdən deyil"

O Xəvaricdən bir firqə olan Əzariqə əqidələrinə sadiq qalaraq öz xütbələrində "La hökmə illa lillah" şüarını dilinə gətirərək günahları şirkə səbəb bilir, qadın və uşaqların .öldürülməsinə icazə vermişdi

Onun ən yaxın köməkçiləri Zəngbar və Sudandan olduğu üçün onu Sahibul Zənnc (Zəncilərin əmiri) adlandırırdılar. O, Zəncilərə, eləcə də Sudan qaralarına əgər ona kömək etsələr hamısını azad edərək yaxşı hədiyyə və mükafat verəcəyinə söz vermişdi nəticədə bu tamahla onun ətrafına yığışıb böyük bir qoşun yaratmışdılar. O da bu zənci qoşununun köməyi sayəsində Bəsrəni fəth edərək orada ۱۴ il ۴ ay hökumətlik etdiyi vaxt zənci qoşunu yenə də qarət və işğala məşğul idi. Beləliklə Sahibul zəng Vasit, Əhvaz və s... şəhərləri öz hökuməti sayəsində birləşdirdi. Təkcə Əhvaz şəhərinin fəthində onun ordusunun sayılan təxminən ۱۸۰ min olduğunu .göstərmişlər

Sahibul zənc ۲۷۰-ci hicri ilində Abbasi xəlifələrinin ۱۵-ci xəlifəsi sayılan Əl-mötəmidu !Billahın xilafəti zamanı qətlə yetirilərək başını bədənindən ayırıb Bağdada göndərdilər

Tarixdə onun Bəsrədəki cinayətləri barədə belə yazıblar: Hicri ۲۵۱-ci il şəvval ayının ۱۷-.də cümə günü Sahibul Zənc Bəsrəyə daxil olub şəhər camaatını qətlə yetirərək

Came məscidi və onun ətrafındakı evləri yandırdı. Eləcə də tarixçi Məs"udinin yazdığına görə o, Bəsrədə ۸۰۰ min nəfəri qətlə yetirmişdi. Onun fəsadı hətta hörmətli qadınların iki üç dirhəmə alınıb satılmasına belə sirayət etmişdi. Belə ki, satıcılar qadınları hərraca qoyub fəryad çəkib deyirdilər: "Bu arvad filankəsin qızıdır:" Bununla .da müştəriləri bu işə cəlb edirdilər

Möminlər ağası Əli (əleyhissalam) Cəməl müharibəsi vaxtı Bəsrənin böyük :şəxsiyyətlərindən sayılan Əhnəf ibni Qeysi çağırıb ona belə buyurdu

Ey Əhnəf! Sanki mən, bir qoşunun tozsuz səs-küysüz, Nəmədən yola düşüb yeri öz"

.addımları altında tapdamasını görürəm

Sonra buyurdu: Vay olsun, o abad küçə və bəzənmiş evlərə ki, ölənlərə ağlayıb itginləri aramırlar. Mən dünyanın üzünü çevirib, çöhrəsini torpağa sürtmüşəm və düzgün ölçü ”.götürməklə ona baxaraq onu öz gözlərimlə müşahidə edirəm

## OTUZ DOQQUZUNCU HEKAYƏT – Çingizçilərin hücumundan xəbər

Monqolların cinayəti, eləcə də tatarların monqol adı altında baş vermiş dəhşətli hücumları tarixdə qan içən qoşun adı ilə məşhurdur. Çingizin əsil adı Təmuçin olmuş özü isə Yəsukay Bahadurun oğlu, monqol qəbiləsinin rəisi idi. O, ٧-ci əsrin əvvəllərində .yaşamamışdı

.Çingiz ۶۱۹-cu ildə, Monqolustana qayıdaraq ۹۲۴-cü ildə ölmüşdü

Monqollar uzaq şərqdə Çin sərhəddinə yaxın Təmğac dağlarında yaşayırdılar. Onlarla İslam ölkələri arasında fasilə altı aydan artıq (o zamanın miqyasına görə) çəkirdi. Monqolların ilk hücumu Türküstana oldu. Xarəzmşah Türküstanı onlara tabe etməyə məcbur oldu Monqollar yavaş-yavaş bütün Türküstan ərazisini işğal edərək .hücumlarını Türküstan sərhədlərindən qıraqlara kimi genişləndirdilər

Amansız qarət və qətllərə başlayan monqollar ۶۱۶-cı ildə Xorasan torpağına hücum edərək qadın və uşaqlara belə rəhm etmədilər. Eləcə də İranın sair şəhərlərinə də .həmlə etdilər. Onlar heç bir qətl və cinayət törətməkdən çəkinmirdilər

Həzrət Əli (əleyhissalam) Sahibül Zəncin Hücumundan xəbər tutduqda (qabaqkı :dastanda quyd olundu) buyurdu

Sanki sifətləri çəkiclə döyülmüş insanları görürəm ki, ipək paltarlar geyib cins atlar“ .üstündə gəzərlər

Onları üçün qan tökmək o qədər adiləşmişdir ki, hətta ölü cəsədlərin üstündən belə ”.sərbəst keçirlər. Onların qaçanları əsir olanlardan azdır

Şərif Rəzi deyir: İmam Əli (əleyhissalam)-ın verdiyi bu qeybi xəbəri biz öz zamanımızda gözlərimizlə müşahidə etdik. Bu xəbərlə onun baş verməsi arasında təqribən ۹۰۰ il zaman fasiləsi mövcuddur. Müsəlmanlar İslamın əvvəlindən öz dövrümüzə kimi belə bir hadisənin baş verəcəyinin intizarında idilər. Nəhayət bu vaqeə bizim əsrimizdə baş verdi. Belə ki, uzaq Şərqdən monqollar gözətçiləri İraq Şam torpaqlarına, eləcə də Xorasan və İranın sair şəhərlərinə hücum edərək misli görünməmiş vəhşiliklər .törətdilər

Çingizin əxlaqi xüsusiyyətlərindən biri aşağıdakı mövzuda qeyd olunubdur. O əmisi

oğlunu öz ordusuna komandir təyin edib ona var qüvvəsi ilə öz hücumunu davam etdirməsini əmr etdi. O da həyat yoldaşı ilə xudaha-fizləşsin deyə arvadının xeyməsinə getdi. Bu xəbər Çingizə yetdikdə o saat öz əmisi oğlunu komandanlıqdan :xaric edib onun yerinə başqasını təyin etdi və dedi

Bir adam ki, arvad onu əməl sür"ətindən az da olmuş olsa saxlayacaq komandanlığa" .layiq deyil

**QIRXINCI HEKAYƏT – Əli (ə) Peyğəmbər (s) xüsusi şagirdi**

səh:۴۶

Əli (əleyhissalam) bundan sonra gələcək təhlükəli hadisələrə də işarə etdikdə Həzrətə ”!?belə ərz oldu. “Ey İmam, qeybdənmi xəbər verirsən

:İmam gülümsəyib buyurdu

Ey Kəlbi qardaş, bu qeyb elmi deyil, bəlkə elə bir əhatəli elmdir ki, onu sahibindən“ (Peyğəmbər) öyrənmişəm.” Sonra buyurdu: Qeyb elmi, eləcə də qiyamət gününün elmi :barədə “Loğman” surəsinin ۳۴-cü ayəsində buyurmuşdu

Şübhəsiz qiyamət günündən xəbər vermə elmi Allaha aiddir və o Allahdır ki, yağışı“ göndərir, ana bətnində olandan agahdır və heç kəs sabah nə olacağını və hansı ”.torpaqda öləcəyini bilmir

Bu sözlə demək istəyirdi ki, Allahın ən dəqiq işlərə belə (ayədə göstərilən beş cür işlər) .agahlığı vardır ki, sizin o işlərdən xəbəriniz belə yoxdur

Allah bütün cüz”i xüsusiyyətləri bilir, lakin Allahdan başqa bu cüz”iyyatı (incəlikləri) :bilən yoxdur. Sonra buyurdu

Bundan əlavə (beş növ) elmi Allah öz Peyğəmbərinə öyrətmişdir ki, o da məni həmin“ elmlərdən hali edibdir. Mənim üçün dua edibdir ki, Allah onu mənim qəlbimdə ”.yerləşdirərək ə”za və əndamımı başdan-başa onunla bürüsün

**QIRX BİRİNCİ HEKAYƏT – Əbuzərin yola salınması**

Əbuzər Qəffari Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin xüsusi əshabı, eləcə də İslamın ən doğru dilavər kişilərindən biri idi (ümmətlərindən idi). O, İslam qanunlarının müqəddəs həyata keçirilməsi uğrunda özünə qarşı edilən məzəmmət və .danlaqlardan çəkinməzdi

:Beləliklə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onun barəsində buyurmuşdu

Bu vaxtacan, Əbuzərdən düz danışan görmədim, Əbuzər müqəddəsliyin ən uca zirvəsində durmuşdu. Belə ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onun :haqqında buyurdu

"!Əli (əleyhissalam), Əbuzər, Miqdad və Salman

Osman öz xilafəti dövründə beytül-malı ürəyi istədiyi kimi yaxın qohum qardaşına bir neçə bərabər paylayır və elə həmin adamları da müsəlman vilayətlərinin valisi təyin .edirdi

Bu vaxt Əbuzər acıqlı ləhn və sözlər ilə Osmanı bu işlərinə görə tənqid atəşinə tutaraq :onun üçün "Tövbə surəsinin ۳۴-cü ayəsini oxumuşdu. Həmin ayə budur

".Qızıl və gümüş toplayıb Allah yolunda xərcləməyənlər üçün şiddətli əzab vardır"

Osman hüzurunda olanlara üzünü tutaraq dedi: "İmam və rəhbərin bir malı (Beytül-"!?maldan) özünə götürməsi rəvadır ki, imkanı olduqda öz borcunu qaytarsın

Kə"bül Əhbar yəhudi ailəsində böyüsə də zahirdə müsəlmanların cərgəsində idi, həm də Osmanın yaxın adamlarından hesab olunurdu, dedi: Heç bir eybi yoxdur Həmin :məclisdə Əbuzər də var idi bunu eşitdikdə bərk narahat olub Kə"bül Əhbara dedi

"!?Ey yəhudizadə, bizim dinimizi bizə öyrədirsən"

:Osman onun bu sözündən əsəbləşib dedi

Ey Əbuzər, mənə qarşı olan azar və dil yaran, adamlarıma qarşı da çoxalmışdır?! .Bundan sonra sənin Mədinədə qalmağa haqqın yoxdur. Birbaş Şama qayıt

Əbuzər Qəffari haqq söyləmək cürmü üstündə Şama sürgün olunaraq Şamın valisi .Müaviyənin nəzarəti altında saxlanıldı

Əbuzər elə Şamın özündə də müxtəlif fürsətlərdə Müaviyənin qeyri insani hərəkətlərinin əleyhinə danışaraq onu ifşa edirdi. Müaviyə öz başı üzərində təhlükə hiss etdikdə Osmana məktub yazaraq Ondan Əbuzərin Mədinəyə qaytarılmasını xahiş .etdi

.Məktub Osmana çatdıqda cavabında Əbuzərin Mədinəyə qaytarılmasını əmr etdi

Məktubun cavabı Müaviyənin əlinə yetişdikdə onu ağır bir vəziyyətdə Mədinəyə

.göndərdi. Belə ki, budlarının əti bədənindən ayrıldı

:Məşhur tarixçi Vaqedi bu barədə belə yazır

Əbuzər (Şamdan qayıdandan sonra) Osmanın hüzuruna gətirildikdə Osman ona belə :dedi

-Allah Qeynin gözünü aydın eləmə“

.(sin” (ya heç bir göz Qeyni görməklə aydın olmasın

.Əbuzər dedi: Mənim adım Qeyn deyil

:Osman dedi

”.Ey Cunəydəb, Allah heç bir gözü səni görməklə aydın etməsin“

Əbuzər isə cavabında mənim adım Condəbdir və Rəsulullah məni Abdullah (Allah bəndəsi) adlandırırdı ki, mən də özüm üçün həmin adı seçmişəm dedi

səh:۴۸

Osman dedi: “Sən elə fikirləşirsən ki, biz “Allahın əli bağlanıb, Allah fəqirdir və biz isə !?varlıyıq” deyirik

Əbuzər dedi: “Əgər belə demirsinizsə, onda Allah malını (beytül-malı) öz yolunda xərcləməli və Allah bəndələrinin əlinə çatdırmalısınız. Ancaq mən şəhadət verirəm ki, :Rəsulullah səlləllahu əleyhi və alihi və səlləmin özündən eşitmişəm ki, buyurur

As sülaləsi otuz nəfərə çatdıqda Allah malını özlərininki, bəndələrini isə öz nökərləri“ ”.sanaraq Allah dinini öz gəlirləri üçün məvacib və maya bilərlər

?Osman orada olanlardan soruşdu: Siz bu sözləri Rəsulullahdan eşidibsiniz

”Dedilər ki, “Yox

”!?Osman dedi: “Vay olsun sənə, ey Əbuzər, Allahın elçisinə yalan nisbət verirsən

Əbuzər üzünü orada olanlara çevirib dedi: Məgər mənim düz danışan olduğumu ?bilmirsiniz

.Dedilər: Yox bilmirik. Osman dedi: Əli (əleyhissalam)-ın dalınca gedib onu bura gətirin

Bir neçə nəfər Əli (əleyhissalam)-ın dalınca gedib Osmanın sifarişini Əli (əleyhissalam)-a çatdırdılar Əli (əleyhissalam) məclisə girdikdə Osman üzünü Əbuzərə tutub dedi: .Bayaq bizim üçün oxuduğun hədisi Əli (əleyhissalam) üçün də oxu

Əbuzər həmin hədisi (Asın övladları otuz nəfərə çatsalar) Əli (əleyhissalam) üçün də :oxudu

Osman üzünü Əliyə (əleyhissalam) tutub dedi: Sən bu hədisi Peyğəmbər səlləllahu ?əleyhi və alihi və səlləmdən eşitmisən

.Əli (əleyhissalam) buyurdu: Yox, eşitmə-mişəm, lakin Əbuzər düz deyir

?Osman dedi: Əbuzərin düz danışan olduğunu haradan bilirsən

Əli (əleyhissalam) buyurdu: Rəsulullah səlləl-lahu əleyhi və alihi və səlləmdən özüm :eşitmişəm ki, buyurub

Göy kölgə salmadı, yer dalına götürmədi o dil sahibini ki, Əbuzərdən düz danışan“ ”.olsun

Hüzurda olanların hamısı “Biz də bu mətləbi Rəsulullah səlləllahu əleyhi və alihi və səlləmdən eşitmişik” deyə etiraf etdilər, Əbuzər üzünü oradakılara tutub dedi: “Mən Asın sülaləsi haqqındakı xəbəri Allah elçisinin səlləllahu əleyhi və alihi və səlləmin özündən eşitmişəm. İndicə siz məni bu xəbərin doğru olub-olmamasında ittiham etdiniz. Heç vaxt Mühəmməd səlləllahu əleyhi və alihi və səlləmin əshabından bu ”.sözləri eşidəcəyimi güman etməzdim ki, eşitdim

Bu yolla Əbuzər yenə də etiraz edərək mətləbləri aydın bir şəkildə bəyan edirdi. .Nəhayət Osman Əbuzəri (Mədinənin bir kilometirliyində) sürgün etdi

Əbuzər də həyat yoldaşı və iki övladı ilə birlikdə bir qız bir oğlan Rəbəzəyə getdi. Bu da .onun qocalıq vaxtına təsadüf edir

Bir neçə müddətdən sonra Əbuzər Rəbəzənin yandırıcı çölündə şəhadətə yetişdi. Onun ölümündən qabaq isə həyat yoldaşı və oğlu elə həmin çöldə məzlumanə bir ...surətdə bu həyatla vidalaşmışdılar. Təkcə bir qızı yadigar və tənha qalmışdı

Əbuzərin sürgün edərkən Osman əmr etdi ki, carçılar elan etsinlər ki, Əbuzərlə danışmağa, ya onu ötürməyə heç kəsin haqqı yoxdur. Lakin Möminlər ağası Həzrət Əli (əleyhissalam) Həsən və Hüseyn (əleyhissalam) Əli (əleyhissalam)-ın qardaşı Əqil ilə Əmmar Yasir Əbuzəri yola salmağa tələsdilər. İmam Həsən (əleyhissalam) Əbuzərlə :danışdığı zaman Mərvan çığırdı

?!Ey Həsən sus! Məgər xəlifənin fərmanını eşitməmisən

İmam Əli (əleyhissalam) Mərvana sarı hücum edib qamçını onun atına ilişdidi və :buyurdu

".Uzaqlaş, Allah səni ölüm oduna atsın"

O, Osmanın yanına qayıdaraq əhvalatı tam təfsilatı ilə ona danışdı. Əbuzər isə onu yola .salanların yanında dayanıb öz dostları ilə vidalaşırdı

Onu yola salanların hər birinin Əbuzərə deyiləsi sözü vardı. İlk növbədə İmam Əli :(əleyhissalam) ona belə buyurdu

Ey Əbuzər, sən Allaha görə qəzəbləndin, elə ona da ümidvar ol. Bu camaat isə öz" dünyası xatirinə səndən qorxdular, sən isə dininin ehtiramına görə onlardan qorxdun. Elə buna görə də onlar sənin üçün (yəni dünya üçün) qorxurlar, qorxun olduğu şeydən uzaqlaş, sən onları möhtac olduqları şeydən çəkindirdin. Sənin isə onların səni .çəkindirdikləri şeyə ehtiyacın yoxdur. Tezliklə bilərsən qələbə kiminlədir

Əgər göy və yerin qapılarını bir bədənin üzünə bağlasalar, əgər o bəndə də Allahdan .qorxarsa, Allah onun üçün başqa bir yol açacaqdır

Bu minvalla İmam Əli (əleyhissalam) Rəsulullah səlləllahu əleyhi və alihi və səlləmin ən düzgün səhabəsini müdafiə edib bizlərə həmişə məzlumların köməyinə yetişib .müdafiələrində durmaq və haqqdan tərəfdarlıq etməyi öyrətdi

## QIRX İKİNCİ HEKAYƏT – Pulgirin cavabı

Osman ibni Əffan hicri ۲۴-cü ilin başlanğıcında Ömər ibni Xəttabdan sonra xilafətə .yetişdi

O, təqribən ۱۲-il xəlifəlik edərək çərşənbə günü günorta zamanı evindəcə qətlə yetirildi. Şiə və sünnü tarixçilərinin yazdığına görə Osman öz xilafəti zamanında müsəlmanların malını ürəyi istədiyi kimi çapıb-talayır, İslam ölkəsinin ən böyük və həssas vəzifələrini (postlarını) öz qohumlarına bağışlayırdı.

Rəsulullah səlləllahu əleyhi və alihi və səlləmin pak səhabələri Osmana qarşı etiraz edib onu bu bəd əməllər və rəftarından əl götürməyə çağırırdılar. Belə bir mövqedə Həzrət Əli (əleyhissalam)-ın etiraz etməsi təbii idi. Belə ki, Əli (əleyhissalam)-la Osman arasında tez-tez savaş və çəkişmə baş verirdi.

Adətən müsəlmanlar Əli (əleyhissalam)-ın hüzuruna gəlib Osmanın xilaf iş və əməlləri barədə o Həzrətə şikayət edirdilər. İmam da onların şikayətinə yetişməyi özünə vəzifə .və borc hesab edirdi

Bu səbəblər üzündən Həzrət Əli (əleyhissalam) tez-tez Osmanla görüşüb ona etiraz edirdi, nəticədə o Həzrətlə Osman arasında çəkişmələr baş verirdi ki, bunun bir nümunəsi "Nəhcül-bəlağə"nin ۱۶۴-cü xütbəsində qeyd olubdur. Bu toqquşmalardan biri Əli (əleyhissalam)-ın Muğəyrət ibni Əxnəslə olan söz çəkişməsidir ki, (Osmanın yaxın adamlarından) onun xülasəsini burada qeyd edirik. Müğəyrə Osmanın bibisi oğlu idi, atası Əxnəs ibni Şəriq Peyğəmbəri As ibni Vail ilə birlikdə Əbtər (Mətuun-nəsl) nəsil verməyən adlandırırdı. O, həmin qrupdan idi ki, onların barəsində "Kövsər" surəsi nazil olmuşdu. Ô; "Şübhəsiz, sənin düşmənin əbtərdir." Onun qardaşı Əbul Həkəm Ühüd müharibəsində Əli (əleyhissalam) tərəfindən öldürüldüyünə görə qara qəlbi Əli (əleyhissalam)-a qarşı kin və ədavət toxumu ilə dolu idi. Bir gün Zeyd ibni Sabit Əli (əleyhissalam)-ın yaxın köməkçilərindən biri, Həzrətə dedi: "Çox yaxşı olardı ki, ".Osmanın yanına gedib camaat tərəfindən olunan şikayətləri ona çatdıraq

.Əli (əleyhissalam)-da Zeydin təklifi ilə razılaşdı

Zeyd Əli (əleyhissalam)-la birlikdə Osmanın yanına gəldi. Müsəlmanlardan da bir qrup, o, cümlədən, Osmanın yaxın tərəfdarlarından olan Müğeyrət ibni Əxnəs onun yanına gəldi. Zeyd ibni Sabit söhbəti açdıqdan sonra İmam Əli (əleyhissalam) buyurdu: And olsun Allaha, Osmanın gördüyü hər hansı bir işiin etiraz dalğalarının sularında qərq olaraq məhkum olunmasını sevmirəm. Məgər ki, xalqın İslami haqqı tapdalanmış ola. O zaman haqqı müdafiə etməyə məcburam. And olsun Allaha mümkün qədər mən .Osmanın yerinə şikayətlərin cavabını verib onların hesabına yetişirəm

Bu zaman Müğəyrət ibni Əxnəs Osmanın xüsusi köməkçisi son dərəcədə alçaqlıqla Əli (əleyhissalam)-a dedi: "Xalqın şikayətinə cavab vermək qüdrəti Osmanda səndən daha çoxdur. Vaxt gələcəkdir ki, həmin şikayət edənlər öz şikayətlərinə görə üzr istəyəcəklər. Bu şikayətlərin sənə heç bir dəxli yoxdur. Əksinə, sənin özün tənbeh .olunmalısan, nəinki tənbih edəsən

Bu çirkin və alçaq sözlərdən sonra İmam Əli (əleyhissalam) o pulpərəst və

:qarınqulunun çavabında belə buyurdu

Ey quyruğu kəsik, lə"nətə gəlmişin oğlu, Ey kök, budağı olmayan ağac, mənimi ittiham" edirsən, and olsun Allaha, Allah sənin köməyində durduğun adamı əziz etməz və sən əlini tutduğun adam öz yerindən qalxmağa qadir olmayacaq. Yanımızdan get, Allah səni yazıq edər. Bacardıqca var qüvvənlə bütün səyini bizim əleyhimizə işə sal Allah "...səni geri qoymasın, yurdda qalmayasan

**QIRX ÜÇÜNCÜ HEKAYƏT – Ədalətin icrası**

səh:۵۱

Osmanın ölümündən sonra müsəlman camaat yığışaraq Əli (əleyhissalam)-a beyət etdilər. O Həzrət haqq və ədaləti dirçəldərək batil və zülmü məhv etmək naminə .rəhbərlik ipini cilovunu əlinə aldı

Bir müddət ötməmiş öz həvayi- nəfsləri naminə maddi və mənəvi göstərişlərinə .çatmadıqlarını görən bir qrup münafiq Həzrətlə olan beyətlərini sındırdılar

.Beləliklə də bu dəstə Əli (əleyhissalam)-la özünün müxalifət marşını başladı

Təlhə Zübeyr, Abdullah ibni Ömər, Səd ibni Əbi Vəqqas, Mühəmməd ibni və s... kimilərin Əli (əleyhissalam)-a etdikləri beyətini Həzrət din və ədalətin hamısı olsunlar deyə qəbul etmişdi. Lakin onların maddi hədəfi buna imkan vermədi. Onların Əli (əleyhissalam)-la vəhdətə atılması tamamilə maddi hədəflər güdürdü ki, təbiidir belə qovuşma uzun sürə bilməzdi. Buna görə də çar-naçar tezliklə Əli (əleyhissalam)-dan .ayrılmalı oldular

.Əli (əleyhissalam) bu insanları danlayıb məzəmmət etməklə onlara belə xitab etdi

Sizin mənimlə olan beyətiniz kor-koranə, hədəfsiz, gözlənilməz (düşünülməmiş)“ deyildi. İndi bizim hədəflərimiz bir-birindən fərqlənir. Mən sizi Allaha görə Allah xəttində görmək istəyirəm, lakin siz isə məni öz şum hədəfləriniz üçün istəyirsiniz. Məhz elə buna görə də mən sizinlə bir ola bilmərəm” Sonra buyurdu: “Ey Camaat! ”.Mənə öz cəmiyyətinizin islahı və səhmana salınması yolunda kömək edin

And olsun Allaha, məzlumun qisasını zalımdan alacaq, zalımların cilovunu yığacağam. !O vaxtacan ki, onu haqq axuruna gətirəm, hətta bu zalımın xoşuna gəlməsə belə

İmam Əli (əleyhissalam) beyəti pozub yolunu azanların macərasında bir neçə mühüm :mətləbə işarə edir

.Siz mənimlə bilərəkdən və fürsət üzü ilə beyət etdiniz-١

Başqalarının beyətində olduğu tək, bu beyətdə zor və tələsməklik yox idi. Bəs onda !!??nəyə görə bu tezliklə beyəti sındırdınız

Mənim hədəfim Allah və onun əmrini icra etməkdən ibarətdir. Siz isə başqa yolla-٢

.gedirsiniz

Qürur atından aşağı enib ağılla fikirləşin ta birlikdə cəmiyyətin islahına başlayıb-۳ .səhmansızlıqlara səhman verək

Bunu bilin ki, mən məzlumların dadına yetəcək və heç vaxt onların haqqını-۴ .əzməyəcəyəm

Zalımın beytül-mal və hökumətdən başqalarından artıq faydalanıb istifadə etmək-۵ istədiyini bilsəm boğazından yapışıb onu şəffaf ədalət suyu və haqqa tərəf .sürükləyərəm

Beləliklə Həzrət Əli (əleyhissalam)-ı haqqın müdafiəsi yolunda zülm və zalımın başını .əzməsini eləcə də əbədi və ölməz sözlərin müşahidə edirik

## QIRX DÖRDÜNCÜ HEKAYƏT – Süfyaninin xəbəri

səh:۵۲

Həzrət Məhdi (əleyhissalam)-ın qiyamının başlanğıcında baş verəcək hadisələrdən biri də Şam vilayətində Süfyani adlı birinin peyda olub Məhdi (əleyhissalam)-ın köməkçiləri tərəfindən İmamın öz rəhbərliyi altında məğlub edilməsidir. Bu hadisəyə müxtəlif rəvayətlərdə işarə edilibdir. Süfyaninin Əbu Süfyanın nəslindən olub rənginin sarı qırmızıya bənzər xoş qiyafəli olması deyilmişdir. Onun ən çox təkrar söylədiyi zikr .aşağıdakılardır

Lakin o qədər murdar və çirkindir ki, hətta ondan uşağa qalmış kənizini belə diri-diri basdıracaqdır. Əlbəttə, onun yeri cəhənnəmdir. İmam Baqir (əleyhissalam) bu barədə :buyurur

Şamda xüsusi bayraqları olan müxtəlif üç qrup: Əshəb, Əbqə”ə və Süfyaninin“ ”.dəstələri peyda olacaqlar

Sonra Həzrət Məhdi (əleyhissalam) Məkkədən müsəlmanlarla birlikdə Süfyani ilə müharibə etməkdən ötrü Şama gəlib onun ordusu ilə vuruşaraq Süfyaninin qoşununu darmadağın edəcəkdir. Süfyaninin özü isə Dəməşqdə Bəğutəi adlı ağacın altında qətlə yetiriləcək. Bəzi rəvayətlərdə bu ağacın hündür və çox budaqlı olması qeyd olunubdur ki, Cəyrədə İordaniya ətrafında bitir. Bununla belə böyük yağı sayılan Süfyani təchiz olunmuş qoşunla Şam və Fələstin torpağında İmam Məhdi (əleyhissalam)-ın ordusu ilə .döyüşərək məğlub olacaqdır

Həzrət Əli (əleyhissalam) xütbələrinin birində Şamda belə bir yağıdan xəbər verməklə yanaşı Məhdi (əleyhissalam)-ın qiyamına, eləcə də onun üstün cəhətlərinə işarə etmişdir. Əllamə Məclisi Əllamə Xoyi və s.. alimlər (Nəhcül-Bəlağəni şərh edənlər) bu .xəbəri Süfyaninin peyda olmağına dair əsaslandırmışlar

:Bu fikir nəzərə daha münasib çarpır. Bu barədə Həzrət Əli (əleyhissalam) buyurub

Sanki səsi Şamdan ucalıb bayraqlarını Kufə ətrafında dalğalandıraraq qızmış və qəzəbli dəvələr kimi (İraqa) tərəf hərəkət edənləri öz gözümlə görürəm ki, yeri başlar .(ilə döşəyəcəklər (çoxlu başları bədəndən ayırırlar

Ağzı açıq bir çox torpaqlar isə onun istila çəkmələri altında qalıb əzilir. Onun cövlangahı

geniş, cəlalı isə böyükdür. And olsun Allaha, sizləri yer ətrafından elə dağıdıb bir-birinizdən ayırar ki, sanki sürmə qabının ətrafında bir az qalmış sürməyə bənzərsiniz.

Bu vəziyyət ərəbin (müsəlmanların) əldən getmiş ağlının geri qayıdaraq İslamın həyat verici qanunlarına əməl etməsilə İslam nuru sayəsində birləşəcəyiniz ana kimi davam edəcəkdir, onunla döyüşə gedib döyüşün. Bunu da bilin ki, şeytan öz əyri yollarını ürək aldadıcı zər və bərq ilə sizə göstərib sizi öz tələsində əsir etsin deyə bu yolda hazır durmuşdur. O zaman Şeytan şərrini özünüzdən uzaqlaşdırmaqdan ötrü Süfyani və Məhdi (əleyhissalam)-ın düşməni olan tağutların qarşısında vuruşun.

**QIRX BEŞİNCİ HEKAYƏT – Haqq ilə batilin fasiləsi**

Möminlər ağası Həzrət Əli (əleyhissalam) bir gün camaatın əxlaqi inkişafı və bu yoldakı :irəliləyiş mərhələləri barədə söhbət etdiyi zaman buyurdu

Ehtiyatlı olun ki, başqasının arxasınca danışmayasınız (yəni nə qeybət edin, nə də .(eşidin

Haqq olmayan sözlər çoxdur ki, onların hamısı aradan getməlidir. İnsana qalacaq .onun öz əməlidir. Çünki, Allah görən və eşidəndir

.Bilin ki, haqq ilə batil arasındakı məsafə dörd barmaqdan artıq deyildir

:Orada olanlardan biri Həzrətə sual verib soruşdu

?Sənin bu sözünü necə başa düşək

İmam Əli (əleyhissalam) barmaqlarını yan-yana tutub qulağı ilə gözünün arasında :qərar verərək buyurdu

”!Batil odur ki, qulağınla eşidəsən, haqq isə odur ki, deyəsən gördüm“

## QIRX ALTINCI HEKAYƏT – Fitnə-fəsad yuvası

İmam Əli (əleyhissalam) Bəsrə camaatı ilə Bəsrənin gələcək fitnə və fəsadları camaatın imanı, hicrəti və cihadı barədə söhbət edirdi. Həzrət bu barədə onlara .müxtəlif nəsihət və möizələr söyləyirdi

:Quran və Quranla bağlı məsələlərdən söz düşdükdə Həzrət belə buyurdu

Hər kim Quran əsasında söz desə, düz deyibdir. Hər kəs də Quranın buyurduqlarına“ ”.əməl etsə bu işdə başqalarından irəli keçibdir

:Bu vaxt bir kişi ayağa qalxıb dedi

Ey Möminlər ağası, bizə fitnə”-dən söylə. Görəsən bu barədə Rəsulullah səlləllahu“ əleyhi və alihi və səlləmdən bir şey sual edibsən?!” İmam onun cavabında “Ənkəbut” :surəsinin ilk iki ayəsini tilavət etdi

“Görəsən camaat öz başlarına buraxılaraq imtahan və sınaqdan keçməyəcəkləri barədə fikirləşirlər?.”

Sonra buyurdu: Mən Peyğəmbəriin bizim aramızda olduğu müddətdə son imtahandan keçə bilməməyimizi bilmirdim. O Həzrətdən bu fitnədən məqsədin nə olmasını soruşduqda Peyğəmbər buyurdu:

“Ya Əli! Məndən sonra mənim ümmətim imtahan verməli olarlar.”

Tezliklə öz malları ilə imtahan və sınaqdan keçərlər, lakin öz dindarlıqlarını Allaha minnət sanar və elə bu hal ilə də Allahın rəhmətinə ümidvar olaraq özlərini Allah qəzəbindən amanda hesab edərlər. Haramı yalan hiylələrlə halal sayaraq şərabı .nəbiz, (kişmiş suyu) rişvəni hədiyyə, sələmi isə ticarət adı altında halal və rəva bilərlər

Peyğəmbərdən bu adamların "mürtədlər" məkanında (dindən dönələr) ya fitnə mənzilində olmalarını soruşduqda Həzrət "Onları fitnə mənzilində qərar ver" deyə .buyurdu

### QIRX YEDDİNCİ HEKAYƏT – Əli (Əleyhissalam)–ın şəhadət eşqi

Hicrətin üçüncü ilində kafirlər müsəlmanları qıraraq İslam hökumətini yıxsınlar deyə Məkkədən Mədinəyə hərəkət etdilər. Müsəlmanlar Ühüd dağı kənarında (təqribən Mədinənin yeddi kilometrliyi) onların qarşısını kəsdilər. İslam ordusu ilə kafir qoşunları arasında şiddətli müharibə başlandı. Bu müharibədə şəxsən Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm və Əli (əleyhissalam)–ın özü döyüşçülər cərgəsində idilər. .Həzrət Əli (əleyhissalam) bu döyüşdə misilsiz və fədakarlıqlar nümayiş etdirdi

Düşmən müharibənin sonunda öz qüvvəsini yalnız Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləm öldürmək üçün hazırlaşmışdı. Bu vaxt Əli (əleyhissalam) yüksək bir dağ .və yıxılmaz bir səddə çevrilərək böyük İslam Peyğəmbərini qoruyurdu

Bu müharibədə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin ləyaqətli köməkçilərindən bir çoxu şəhadət şərbətini içib bu dünyaya vida etdilər. Bu müharibədə Əli (əleyhissalam)–ın bədəni altmış yerdən yaralanmışdı. O Həmzə Məs"əb, Abdullah ibni Cahş, Hənzələ və s.. İslam şəhidlərinin pak bədənlərini gördükdə vücudu şəhadət eşqilə dolmuşdu. Həzrət Əli (əleyhissalam) şəhadət şərbətinin müxlis köməkçilərlə birlikdə ona nəsib olmamasından bərk həyəcanlanmışdı. O, bu həyəcanı :Əli (əleyhissalam)–ın simasından sezərək üzünü ona tutub buyurdu

Dediklərim baş vermişdir amma de görüm sənin səbrin necədir?!" İmam Əli" (əleyhissalam) ərz etdi: Ya Rəsulullah

Bura səbr və istiqamətin yeri deyil, əksinə bəşarət və şükrün yeridir" (təsliyət yeri" !(deyil, əksinə təbrik yeridir

:Məşhur sünni alimi İbni Əbil Hədid bu xütbənin şərhində belə yazır

:Hədis və tarix yazanlardan bir çoxu nəql ediblər ki, İmam Əli (əleyhissalam) buyurdu

Allah məftunlarla cihadı (fitnəyə gedənlər) müqərrər edibdir necə ki, müşriklərlə“ ”.cihadı mənə müqərrər etdi

”!?Dedim: “Ya Rəsulullah! Bu fitnə nədir ki, onda cihad mənə müqərrər olub

Buyurdu: “Bu cihad Allahın birliyinə və mənim risalətimə şəhadət verən cəmiyyətə ”.aiddir ki, həqiqətdə onlar sünnətimin əleyhinədirlər

Dedim: “Bir haldaki onlar Allahı birliyinə və sənin risalətinə şəhadət verirlər hansı ”?əsasla onlarla müharibə edim

Buyurdu: “Dində əmələ gətirdikləri bidətə görə ki, onlar nəticədə mənim əmrimlə ”.müxalifət edirlər

Dedim: “Ya Rəsulullah! Sən qabaqcadan mənə şəhadət və”dəsi vermisən, Allahdan istə ki, onu sənin hüzurunda əncam versin (ürəyim istəyir ki, sənin astananda və sənin ”.məhzərində şəhadətə yetişəm) həm də onu təxirə salmasın

Buyurdu: Bəs o zaman kim nakisinlərlə (beyəti pozan müharibə qızışdırıcılar) və qasitinlər (Müaviyə və tərəfdarları) və mariqinlərlə (xəvariclər) vuruşacaq?! Sənə .şəhadət və”dəsi verirəm ki, bu və”də tezliklə sənə nəsib olar. İnşallah

Sənin başından qılınc vurub saqqalını başının qanı ilə rəngləyərlər. O zaman səbrin“ ”!?necə olacaqdır

”.Dedim: “Ya Rəsulullah! Bura səbr yeri deyil, əksinə şükr və həmd yeridir

Buyurdu: “Bəli bu hadisələr sənin üçün qabağa gələcəkdir. Elə isə bütün bunlara qarşı ”.hazır ol

”.Dedim: “Ya Rəsulullah, az da olmuş olsa o hadisələri mənə bəyan etmənizi istərdim

Budurdu: “Mənim ümmətim məndən sonra tezliklə fitnəyə düşərək Quranı tərcümə

edib onu öz ürəkləri istədiyi kimi mənalandırar, şərabı təbiz adına (kişmiş suyu) halal sayıb, rişvəni hədiyyə, sələmi isə alver adı ilə rəva bilərlər. Quranı əsl anlayışından ".təhrif edərlər

.Beləliklə də öz yollarını azarlar

Belə bir vaxtda öz evində əyləş (onlardan küs) camaat sənə tərəf üz gətirdikləri vaxt (batini məna) Quranın batini mənası əsasında müxaliflərlə çarpış. Necə ki, mən tənzil əsasında (yəni Quranın zahiri əsasında) vuruşdum. Bunu da bil ki, sənin zamanının .camaatı mənim zamanımın camaatı ilə bir olmayacaqdır

Dedim: Ey Allahın Rəsulu! Mən bu adamları (öz müxaliflərimi) hansı dərəcəyə mənsub !?edim? Mürtədlər

Buyurdu: Onları "fitnə" dərəcəsində tanıt. Belə ki, qoy ədalət onları tapana kimi .sərgərdan qalsınlar

!Dedim: "Ey Allahın Rəsulu

"!?Görəsən ədalət onları bizim tərəfimizdən tutacaq, yoxsa başqaları tərəfinədən

Buyurdu: Ədalət onları bizim tərəfimizdən öz vasitəmizlə tutaraq tam qələbə hasil olacaqdır. Məhz bizim vasitəmizlə Allah şirkdən sonra qəlbləri (tovhid xəttində) bir-.birinə qovuşduracaqdır

.Bəli, məhz bizim vasitəmizlə fitnə və fəsaddan sonra qəlblər bir-birinə qovuşacaqdır

:Dedim

”.Həmd olsun fəzilət və nemətlər bağış-layan Allaha“

Bu dastan bunu bizə çatdırır ki, bəzən müsəlmanların hakimi günah və fitnəkarlığa qərq olmuş müsəlmanlarla da vuruşmalıdır ki, onları müharibə vasitəsilə haqq yoluna .dəvət etsin

**QIRX DOQQUZUNCU HEKAYƏT – HƏZRƏT Əlidə zahidlik nümunələri**

İmam Əli (əleyhissalam) “Nəhcül-bəlağə”nin ۱۶۰-cı xütbəsində həmd və sənadan sonra camaatı moizə və nəsihətə başlayır. Daha sonra Allaha pənah apararaq maddiyyatın quluna çevrilərək onu hədəf satanlardan bərk narahat olduğunu bildirib onları tənqid atəşinə tutur, söhbət əsasında dörd böyük Peyğəmbərlərdən onlar üçün nümunə gətirərək həyat və yaşayışlarını bu Peyğəmbərlər kimi tənzim etmələrini .tapşırır. Həmin ۴ böyük Peyğəmbər aşağıdakılardır

.(İslam Peyğəmbəri ۲-Həzrət Musa ۳-Həzrət Davud ۴-Həzrət İsa (əleyhimussalam-۱

Bununla belə adı qeyd olunan Peyğəmbərlərin hər biri ilə əlaqədar “Nəhcül-bəlağə”yə diqqət yetirməklə onların pərhizkarlığı və yetginlikləri barəsində gəlmiş dastanı əziz .oxuculara çatdırırıq

**ƏLLİNCİ HEKAYƏT – Əli (Əleyhissalam) Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin ardıcılı**

Əli (əleyhissalam) buyurur: Dünyanı hədəf satmağın bəyənilməzliyi barədə İslam Peyğəmbərini özümüzə örnək və nümunə saymağımız kifayət edər. Eləcə də ۱۵۰-ci :xütbənin sonunda bu barədə belə buyurur

Allahın dərgahında ən əziz bəndələr İslam Peyğəmbərindən nümunə götürüb“ addımını onun ləhirinin yerinə qoyanlardır.” Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm ac qarınla dünyadan köçərək ruh sağlamlığı və imanla əbədiyyətə sarı qanad açdı. Doğrudan da Allah bizə nə böyük nemət verdi. Və bizə inayət elədi ki, məhz onun

xətti ilə hərəkət edək. And olsun Allaha əynimdəki köynəyimi o qədər yamamışam ki, artıq yamayandan utanıram. Bir şəxs etirazla mənə dedi:

”.Niyə bu köhnə paltarı çıxarmırsan!” Ona dedim: “Məndən uzaqlaş“

### ƏLLİ BİRİNCİ HEKAYƏT – İslam Peyğəmbərinin zahidliyi

İslam Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləm öz ehtiyacı qədər dünyadan artıq bəhrə almadan özü hamıdan artıq qarnı ac idi... Yerin üstündə (döşəksiz) oturduqda qullar kimi təvazökarcasına əyləşərdi, özü öz əli ilə ayaqqabı və paltarını yamayardı. .Peyğəmbər həmişə yəhərsiz ata minsə də bir adamı da öz tərkinə mindirirdi

Bir gün evin qapısında (arvadlarından birinin hücrəsində) asılmış bir pərdini gördükdə :öz həyat yoldaşına buyurdu

Onu məndən uzaqlaşdır, Hər vaxt gözüm ona sataşdıqda dünyanı öz gözəllikləri ilə“ ”.mənim yadıma salır

Bəli, o bütün varlığı ilə dünyanın zərq və bərqindən gözünü çəkmiş dünyanın yad .etməyi isə özündən uzaqlaşdırmışdı

Həzrət bu dünyanı özünə karvansara sanırdı. Buna görə də ona ürək bağlamağı özünə .rəva bilmirdi

Sizdən soruşuram: Görəsən, Allah öz haqq yolu üçün seçdiyi Mühəmmədi əziz tuturdu, .yoxsa ona ihanət edirdi? Əgər bir kəs desə: Allah onu təhqir edibdir

And olsun Allaha ki, yaradana böyük yalan nisbətini veribdir. Yox, əgər desə ki, onu əziz tutbdur onda gərək bilməlidir ki, Allah ondan başqasını təhqir edibdir. Buna görə .də Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləmi özünüzə ülgü və örnək sanın

Yalnız onun xəttində hərəkət edin, yoxsa sizin yolunuz həlakət və uçurumla .nəticələnəcəkdir

### ƏLLİ İKİNCİ HEKAYƏT – Musa (Əleyhissalam)–ın pərhizkarlığı

Sonra Əli (əleyhissalam) bu xütbədə (۱۶۰) Həzrət Musa (əleyhissalam)–ı xatırlayıb buyurur: İstəyirsən, İslam Peyğəmbərindən sonra Allahın elə dostunu xatırlayam ki, :?Allah dərgahına sarı hacət əlini götürüb belə dua buyurmuşdur

İlahi hər nə xeyir və yaxşılıq mənə nazil etsən ona ehtiyacım vardır.” (“Qəsəs” surəsi,“ (۲۴

And olsun o böyük Allaha ki, Musa (əleyhissalam) Allahdan yeyəcəyi çörəkdən başqa bir şey istəmədi. Çünki, o Həzrət yerin otunu (ələfini) yeyirdi belə ki, arıqlıqdan və ətinin azlığından yediyi otun göyü qarnının nazik dərisinin arxasından görünürdü! :Rəvayətlərdə gəlib ki, bir gün Musa (əleyhissalam) Allaha belə ərz etdi

Mən acam” Allah buyurdu: “Sənin aclığını bilirəm” Musa ərz etdi: “Məni öz yeməyinlə“ ”.(ruzinlə) qidalandır

Allahın Musa (əleyhissalam)-la olan vəhylərindən biri də bu idi:

“Ey Musa! Yoxsul o kəsdir ki, mənim kimi başçısı yoxdur. Xəstə o kəsdir ki, mənim kimi təbibi yoxdur, qərib o kəsdir ki, mənim kimi munisi yoxdur.

Ey Musa! Bir tikə arpa çörəyinə razı ol. Dünya sənə tərəf üz döndərdikdə de:

“Hamımız Allah tərəfinən gəlmişik və onun tərəfinə də qayıdacağıq.” Dünyanın sənə arxa çevirdiyini gördükdə isə belə de:

“Afərin salehlərin şüarına.” Ey Musa! O şey ki, Allah Firona verib təəccüblənmə, onlar dünyanın davamsız həyat zirvələridir!”

səh:۵۹

### ƏLLİ ÜÇÜNCÜ HEKAYƏT – Davud (Əleyhissalam)–In pərhizkarlığı

Sonra Əli (əleyhissalam) həmin xütbədə (۱۶۰) buyurur: İstəyirsən üçüncü nümunəni Davud (əleyhissalam)-dan deyim ki, behiştin xanəndəsidir. O xurma liflərindən öz əli ilə zənbillər toxuyaraq öz camaatına belə deyirdi: Sizlərdən hansı biriniz bu zənbillərin satılmasında mənə kömək edə bilərsiniz? Öz əli ilə toxuduğu zənbillərin pulundan arpa .çörəyi əldə edib onunla dolanırdı

İmam Sadiq (əleyhissalam) buyurmuşdu: Allah Həzrət Davud (əleyhissalam)-a belə vəhy etdi: "Sən yaxşı bəndəsən əgər beytül-maldan yeməsəydin!" Davud (əleyhissalam) qəmgin olub ağlamağa başladı, Allah onun üçün dəmiri yumşaltdı, nəticədə isə Davud hər gün dəmirdən zireh (döyüş köynəyi) düzəldib onu min dirhəmə satırdı. Beləliklə də o ۳۶۰ zirehi ۳۶۰ min dirhəmə satdı. Bir daha beytül-maldan istifadə etmədi. Bundan əlavə Allah Peyğəmbərlik məqamından savayı onu şahlıq dərəcəsinə kimi ucaldıb bütün imkanları Davudun ixtiyarında qoydu. Lakin, o, öz zəhməti, alın .təriylə zənbil və zireh toxuyub satar, beləliklə öz sadə yaşayışını təmin edərdi

### ƏLLİ DÖRDÜNCÜ HEKAYƏT – İsa (Əleyhissalam)–ın yetkinliyi

:Həzrət həmin xütbədə yenə də (۱۶۰) buyurur

İstəyirsən Həzrəti İsa (əleyhissalam) barəsində (onun yetginliyinə dair) söz açam? Bil" ki, qalın və kobud paltar geyir, quru çörək yeyirdi. Onun yeməyi aclıq, gecə çırağı ay, qış örtüyü isə şərq və qərb torpaqları idi (səhərlər məğribdə günortalar isə məşriq "(tərəfdən günəşlə üzbəüz gəzirdi

Yerdə dörd ayaqlılar üçün bitənlər onun meyvə və gülləri hesab olunurdu. Onu özünə məşğul edə biləcək nə arvadı var idi, nə də qəmgin edəcək övladı, nə də dövləti var idi ki, diqqətini özünə cəlb etsin. Onun nə də tamahkarlığı var idi ki, onu xar etsin. Onun .atı, iki ayağı, xidmətçisi isə iki dostu idi

İddətüd-dai" kitabında bu məzmunda Həzrət İsa (əleyhissalam)-dan nəql olubdur." :Daha sonra Həzrət yenə buyurdu

Dünya malından mənim bir şeyim yoxdur, eyni halda yer üzündə heç kəs mənim kimi"

Həm də İmam Sadiq (əleyhissalam)-dan nəql olunubdur ki, Həzrət İsa haqqında İncil :kitabında belə gəlib: İsa (əleyhissalam) Allaha ərz edirdi

İlahi, həm səhər, həm də geçə mənə bir arpa fətiri əta elə, lakin artıq vermə ki,“ ”.tüğyan edəm

## ƏLLİ BEŞİNCİ HEKAYƏT – Vaxtsız və yersiz suala cavab

Siffeyn müharibəsi idi Əli (əleyhissalam)-ın ordusu Müaviyənin ordusu ilə hər tərəfdən tutaşmışdılar. Belə bir həngamdə İbni Dudan adlı qohumlarından biri Əli (əleyhissalam)-ın hüzuruna gəlib dedi: Siz həm nəsəb, həm də Peyğəmbərlə qohum olmağınız və həm də Quranı bilmək sarıdan Peyğəmbərə hamıdan artıq yaxınsızınz. ?.Bəs onda niyə sizləri olduğnuz məqama yetişməyə qoymadılar

Baxmayaraq ki, ibni Dudanın niyyəti yaxşı idi, həm də Həzrətin qohumlarından idi,) .(lakin vaxtsız sual etdi

:İmam Əli (əleyhissalam) ona buyurdu

Ey Əsədi qardaş, sən çox tələsərək vaxtsız və yersiz sual etsən də qohumluq ehtiramına, eləcə də sual edənin haqqına riayət etməyə görə sənin cavabını verməyə .məcburam

Bil ki, adamların rəhbərlikdə mənə qarşı zülmü barədə baxmayaraq ki, bizim Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmla olan nisbətimiz hamıdan yüksək və ona olan peyvəndimiz hamıdan daha çoxdur, buna görə idi ki, bir qrup adam bu .(məqama paxıllıq edirdilər (və ona yiyələndilər

Digər bir qrup da (biz özümüz) onların bu işinə göz yumdu, hakim yalnız Allahdır və .bizim hamımız qiyamət günü onun tərəfinə qayıdarıq

Keçmişdən sual etmə, bu gün biz üzləşdiyimiz hadisələr haqqında (Müaviyə ilə müharibə) soruş! Ruzgar məni ağladandan sonra güldürdü (təəccübə gətirdi). Gəlin, bu böyük və qəribə işə təəccüblənək. Əgər çətinliklər aradan götürülsə onları xalis haqqa ,doğru sövq etdirərəm yoxsa ki

Buna görə də onlara həsrət çəkib öz canına qəsd etmə, Allah onların törətdiklərindən“ agahdır.” (“Fatir”, ٨)

## ƏLLİ ALTINCI HEKAYƏT – Osmana nəsihət

səh:٦١

Osmanın xilafət dövrü idi. Müsəlmanlardan bir qrupu İmam Əli (əleyhissalam)-ın yanına gələrək ondan Əliyə şikayət etdilər. Əli (əleyhissalam) -dan xahiş etdilər ki, .Osmanla söhbət edib onu xətalarından çəkindirsin

İmam Əli (əleyhissalam) (bu siyasi məsələlərə laqeyd qalmadı). Onların istəyini nəzərə alıb Osmanın yanına gələrək ona nəsihət etməyə başladı. Bu nəsihətində camaatın etiraz və şikayətini söylədikdən sonra buyurdu: “Bil ki, Allah hüzurunda olan ən yaxşı bəndə hidayət olub başqalarını da hidayət edən adil rəhbərdir ki, sünnətini ”.canlandıraraq daha da möhkəmləndirir

Allah qarşısında insanların ən pisi öz yolunu azıb başqalarını da yolundan sapdıran“ zalım rəhbərdir ki, düzgün sünnətləri məhv edib tərk olunmuş bid”ətləri dirildər.” :Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurub

Zalım rəhbəri qiyamət günü səslərlər, o zaman onun nə köməyi olar nə də üzr“ ”.istəməyə üzü

Onu cəhənnəm oduna atarlar. Bundan sonra dəyirman daşı odda fırlanmağa başlar, daha sonra isə onu cəhənnəmin dərinliyində zəncirə çəkərlər. Olmaya sən olasan ki, :Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm həmişə buyururdu

Bu ümmət bir rəhbəri öldürdükdən sonra qiyamətə qədər ölüb öldürmə qapıları“ ”...onların üzünə açılar

:Bir az danışıqdan sonra yenə buyurdu

Səni and verirəm Allaha, məbada ətlərinin cilovunu Mərvanın əlinə verəsən ki, o da“ ”.onu istədiyi tərəfə çəksin

”.Osman dedi: “Camaatdan mənə möhlət al, ta onların tapdanmış hüquqlarını qaytarım

:İmam buyurdu

Mədinəliləri deyirsənsə onda möhlət yoxdur. Tez işə başlamaq lazımdır ki, Mədinədən“ ”.çıxmaq möhləti sənin dəsturunun onlara çatması qədərdir

Bu tərtiblə: görürük ki, İmam Əli (əleyhissalam) ən ali əxlaqi və siyasi üsulla Osmana .nəsihət edib böyük ədəb və kamallla məntiqi işlərin başlanmasına zəminə yaradır

## ƏLLİ YEDDİNCİ HEKAYƏT – Məntiqi qəbul etmək

Kuləybe Cərmi deyir: Mədinədə Osmanın ölümündən sonra Təlhə və Zübeyr Bəsrəyə gələrək camaatı Əli (əleyhissalam)-ın hökumətinə qarşı qaldırdılar. Bununla da Cəməl .müharibəsinin özülünü qoydular

səh:۶۲

Bir azdan Əli (əleyhissalam) öz ordusu ilə beyət sındıran üsyançıları yerlərində otuzdurmaqdan ötrü Bəsrəyə tərəf hərəkət etdi. Qoşun Ziyqar məhəllinə çatdıqda qəbilə rəislərindən iki nəfər mənə dedilər: Bizimlə gəl, Əli (əleyhissalam)-ın hüzuruna ?gedib görək ki, onun bu yürüşdən hədəfi nədir

Mən onların sözünü qəbul edib onlarla birgə Ziy Qara yetişdik. Onun ərəblərə ən fərasətli rəhbər olmasını öz gözlərimizlə gördük. O qəbilə rəisləri barədə məndən suallar etdikdə mən də cavab verirdim. Danışıqdan və mətləb aydınlaşandan sonra :mənimlə gələn yoldaşlar Həzrətlə beyət etdilər. Daha sonra o Həzrət mənə buyurdu

”?Bəs sən beyət etmirsən“

Dedim: Mən qəbilənin sifarişi aparıb gətirəniyəm. Gərək bu xəbəri onlara çatdıram. Gördüm ki, alınlarında səcdə əsəri olan köməkçilərindən bir qrup dalbadal mənə deyirdilər: beyət et bu zaman Əli (əleyhissalam) buyurdu: Azad buraxın onu məni bu dəlillərlə (“Nəhcül-bəlağə”nin mətnində gəlib) qane edib və nəhayət haqq :aydınlaşandan sonra beyət etdim. O dəlillər bu idi

Kuləyb mənə dedi: Mən sifariş gətirib aparanam və gəlmişəm öz qəbiləm üçün buradan bir xəbər aparam (və mənim qərar qəbul etməyim öz qəbiləmizin mərkəzi :təşkilatının varlığı əsasında olur) İmam Əli (əleyhissalam) ona buyurdu

Əgər qəbilən səni bu mövzu üçün göndərsəydi ki, yağışın yağdığı yeri onlar üçün tapsan, daha sonra onlara tərəf qayıdaraq gördüyün yaşıllıq və su məkanından xəbər versəydin əgər sözünün əksinə hərkət edib otsuz-susuz bir çöllüyə tərəf getsəydilər, sən nə edərdin?! Özüm otu və suyu çox olan yerə gedərdim Həzrət buyurdu: “Beləliklə :əlini beyət əlaməti olaraq qaldır.” O şəxs deyir

And olsun Allaha, elə ki, İmamın dəlilərini eşidib haqı tanıdım, ondan boyun qaçırmaq“ ”.yolunu tapa bilməyib o Həzrətlə beyət etdim

.İmam Əli (əleyhissalam)-ın məntiq, dəlil və şəmşir əhli olmasını görürük

Ruhi cəhətdən hazırlıqları olub ürəklərində mərəz və xəstəlik olmayanlar isə o Həzrətin dəlillərinə cəzb olunaraq ona qovuşurlar. Eyni halda Əli (əleyhissalam)-ın öz

yuxarıdakı sözlərində bütün bəşəriyyətə hər zaman üçün fikir azadlığı dərsi öyrətməsini görürük. Öz youlnu azanların bir çoxu süni hasar və təşkilatın mühasirəsində qalaraq əsirə çevrilirlər. Kuləyb isə bu hasarı Əli (əleyhissalam)-ın .ardıcılına çevrilməklə sındırıb haqqa qovuşdu

**ƏLLİ SƏKKİZİNCİ HEKAYƏT – İmamətin müdafiəsi**

səh:۶۳

Peyğəmbərin rehlətindən sonra baş verən xilafət və rəhbərlik hadisəsində İmam Əli (əleyhissalam)öz xilafət və rəhbərliyini ətraflı dəlillərlə sübut edərək öz haqqını müdafiə edirdi. Bu arada Səd ibni Əbi Vəqqas (şura üzvlərindən biri) Əli (əleyhissalam)-a dedi: "Sən bu (xilafət) işə hərissən".

İmam da onun cavabında belə buyurdu: Sizin Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmə qovuşmaq nisbətiniz çox olduğundan bu işə də hərissiniz. Amma həm məktəb, həm də nisbəti cəhətdən Peyğəmbərə daha yaxın olan mən isə öz haqqımı tələb edirəm. Sizlər isə haqqımla müxalifətlik edərək məni döşümdən itələyirsiniz.. Dəlil və məntiqlə camaat qarşısında vilayətə özünün daha layiqli olmasını sübut edən Əli (əleyhissalam)-a qarşı etiraz edənin özü (Səd və ya Əbu Übeydə) Həzrətin cavabında nə deyəcəyini belə bilmədi. Sonra İmam aşağıdakı duanı buyurdu: İlahi, mən Qüreyş və onları himayət edənlərin haqqında sənin dərhgahından kömək istəyirəm ki, onlar mənimlə olan tellərini qıraraq böyük məqamımı kiçik sandılar. Haqqımı qəsb edib mənimlə vuruşmaqdan ötrü əlbir oldular.

## ƏLLİ DOQQUZUNCU HEKAYƏT – AllahI tanımaq

İmam Əli (əleyhissalam) öz xilafəti dövründə camaata bu müraciətlə çox buyururdu:

"Hələ aranızdan getməmişdən

qabaq məsələlərinizi məndən soruşun." Bir gün güclü cəsur, eləcə də dildən iti adam olan Zi"ləb Yəməni öz dostlarına belə dedi:

Əbu Talibin oğlu artıq təhlükəli uçurumun zirvəsində durmuşdur. Bu gün ondan edəcəyim sualla onu camat qarşısında utandıracağam.

Elə bu qərarla da məscidə gələrək camaatın qabağında Əli (əleyhissalam)-dan soruşdu: "Ya Əmirəl-möminin! Yaradanını görmüsən?!"

İmam buyurdu: Mən görmədiyim Allaha sitayiş edə bilmərəm.

Zil"əb dedi: "Allahı necə görmüsən?!"

İmam buyurdu: "Heç zaman gözlər onu görməz, lakin imanın həqiqət aynasında yalnız

qəlblər onu görə bilərlər.” O, Hər şeyə yaxındır, amma belə də yox ki, onlara bitişmiş olsun, eləcə də o hər şeydən uzaqdır, amma belə də yox ki, onlara laqeyid qalsın. O, qabaqcadan fikirləşməmiş danışır, həm də qabaqcadan qərar qəbul etməmiş iradə !göstərir

### ALTMIŞINCI HEKAYƏT – Qarğış

Bəni-Naciyə qəbiləsindən olan ibni Raşid adlı bir şəxsin təhriki nəticəsində Kufə ordusundan otuz nəfərə yaxın döyüşçü Xəvaricə qoşulmağı planlaşdırmışdılar. İmam Əli (əleyhissalam) köməkçilərindən birini onların vəziyyətindən xəbərdar olub ona məlumat versin deyə onlara sarı göndərdi. O da gedib bu yağı və əks inqilabi qrupun .vəziyyətini yaxından yoxlayaraq İmamın hüzuruna qayıtdı

İmam ondan soruşdu: "Gördüyün şəxslər özlərini amanda hiss edirdilər yoxsa elə "!?yerlərində durmuşdular.? Bəlkə qorxub qaçdılar

O ərz etdi: "Onlar qorxub qaçdılar." İmam Əli (əleyhissalam) onlara qarşı belə qarğış :etdi

Allahın rəhmətindən Səmud qovmu uzaq olduğu tək uzaqlaşsınlar Sonra buyrudu:" Agah olun əgər bizim nizə və şəmşirlərimiz onları tutsaydı öz keçmişlərindən peşman olardılar, bu gün şeytan onlardan təfriqə yaratmalarını istəmişdirsə sabah onlardan bizarlıq axtaracaqdır." Onların haqqında təkcə bu kifayətdir ki, hidayət yolunu buraxıb .zəlalətə yuvarlanmışlar. Onlar haqq yolunu itirib sərgərdanlıq tərəfə getmişlər

### ALTMIŞ BİRİNCİ HEKAYƏT – Əli (Əleyhissalam)–In şəhid yoldaşlarından xatirəsi

.Novf ibni Füzaleye Bikali Huməyr qəbiləsindən olmuş, əsli isə Həmədandan idi

Bu tayfa ona bir başçı kimi ehtiram bəsləyirdi. Novf Əli (əleyhissalam)-ın yaxın :köməkçilərindən idi. O deyir

Həzrət Əli (əleyhissalam) Kufədə Kufə məscidi yanında bir daşın üstündə durub aşağıdakı xütbəni (١٨٢) buyurdu Bu vaxt İmam yundan qalın və kobud bir köynək geymiş, şəmşirini xurma lifindən düzəlmiş bir bağla boynundan asmışdı. Ayağına xurma lifindən ayaqqabı geymiş, alnı isə səcdənin təsirindən qabar bağlamışdı. Allaha həmd və səna söyləyib təqvaya sifariş etdikdən sonra nəsihət edərək ölümü təzəkkür verib şah və qolu zorluları xatırladı. Daha sonra onların çalasına düşənləri qeyd etdi. Bu xütbəsində Həzrət Məhdi (əleyhissalam) Allahın höccətindən səlləllahu əleyhi və alihi və səlləm söz açmaqla Allah yolunda ixlasla qədəm götürmüş və Siffeyn

:müharibəsində şəhadətə yetişmiş yaxın silahdaşlarını xatırlayıb buyurdu

”!?Haradadırlar o qardaşlarım ki, yoluma atla gəlib haqq yolunda qədəm atdılar“

səh:۶۵

Haradadırlar Əmmar və ibni Yəthan və Zuş-şəhadətəyn və bunlara bənzərlər ki, canlarını fəda etmək üçün əhd-peyman bağladılar.? Başları zalımlara ərməğan .?getmişlər hanı

:Sonra əlini şərif saqqalına çəkərək uzun müddət göz yaşı töküb buyurdu

Onlar həmişə Quran oxuyub onun buyurduqlarına əməl edərək Quranı ayağa qaldırırdılar. Bu şəxslər sünnətləri canlandırıb bid"ətləri məhv etdilər. Bununla yanaşı cihada olan dəvətdən qaçmır, öz rəhbərlərinə inanıb onun xəttində möhkəm :durmuşdular. Sonra hündür səslə belə fəryad etdi

Əmmar, məhşur səhabə Əmmar Yasirdir ki, öz saqqalını İslama xidmət etməklə" ağartmış həmişə də Peyğəmbər və Əli (əleyhissalam) ilə çiyin-çiyinə irəliləmiş nəhayət Siffeyn müharibəsində ٩۴ yaşında şəhadətə yetişmişdi. ibni Yəthanda həmin Əbul Meysəm Malik ibni Yəthandır ki, Bədr və Ühüd müharibələrində İslam ordusunun, eləcə də digər İslam müharibələri ordusunun başçılarından sayılırdı." O da Siffeyn müharibəsində Əli (əleyhissalam)-ın hüzurunda şəhadətə yetişdi. Zuş şəhadətəyn– Xüzeymət ibni Sabitdir ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin zamanında İslam sərdarlarından idi. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onun şahidliyini iki nəfərin yerinə bir məsələdə qəbul etdiyinə görə onu Zuş-şəhadətəyn (iki şahid sahibi) çağırırdılar. O, da Siffeyn müharibəsində, Əmmar şəhadətə yetdikdən sonra .meydana atılaraq düşmənlə vuruşdu və şəhadətə yetişdi

Ey Allahın bəndələri! cihad! cihad!..." Bilin ki, mən bu gün ordunu cəbhəyə sarı" .çağırıram. Allahla görüşmək arzusunda olanlar evdən çıxıb bizimlə birgə irəliləsinlər

Novf deyir: Həzrət Əli (əleyhissalam) oğlu Hüseyni on min nəfərə, Qeys ibni Sədi başqa .on min nəfərə Əbu Əyyub Ənsarini isə daha başqa bir on min nəfərə, başçı təyin etdi

Həzrətin bu döyüşçülərlə birgə Müaviyə ordusuna qarşı Siffeyn müharibəsinə qayıtmaq fikri vardı. Cümə ötməmiş İbni Mülcəmin başçılıq etdiyi qoşun Həzrətin .qoşununa zərbə vurdu. Ordu qayıtdı

Biz canavarların hər tərəfdən hücum edəcəyi çobansız sürü kimi dağınıq düşüb qəlbi"

”.yanıq olmuşduq

## ALTMIŞ İKİNCİ HEKAYƏT – Musa və qardaşının təvazökarlığı

Həzrət Musa (əleyhissalam) Ülul-Əzm Peyğəmbərlərdən biridir. Qardaşı Harun isə Musanın səlləllahu əleyhi və alihi və səlləm risalətini yerinə yetirən Peyğəmbərlərdən sayılırdı. Onların vaxtında Misir torpaqlarında Firon hökumətlik edərək camaatı :bütpərəstlik və şirkə dəvət edirdi. İmam Əli (əleyhissalam) buyurdu

Musa ibni İmran qardaşı ilə birlikdə (Fironu tövhidə dəvət etmək üçün) Fironun yanına .gəldilər. Onların əynində yun paltar əllərində isə bir əsa var idi

Fironla danışdıqda ona belə bir söz verdilər ki, əgər Firon Allah fərmanına təslim olub .haqqın ayinini qəbul etsə, hökumət, izzət və şövkəti davam edib daim qalacaq

Amma Firon (qürur təkəbbür və dünyanın zərq və bərqinə qərq olduğnundan onları kiçik hesab etdi) dedi: "Görəsən bu iki nəfərə təəccüblənmirsiniz ki, mənim səltənətimin əbədi qalması və davamı bunların istəyini qəbul etməyimlə bağlıdır?! Bir haldaki, yoxsulluq bunların qiyafəsindən bəllidir (əgər düz deyirlərsə) niyə onlara var-dövlət və qızıl qolbaqlar verilməmişdir?" Firon qızıl və var-dövlət yığmağı səadət və böyüklük nişanəsi hesab etdiyindən sadə, kobud və yun paltar geyməyi kiçik sanırdı. Əgər Allah istəsəydi hər cür imkanı öz Peyğəmbərlərinin ixtiyarında qoyardı, lakin o .zaman imtahan sınaq imkanat və cəza aradan gedirdi

Həmin mətləb Quranda başqa təbirlə ("Zuxruf" surəsi, ayə: ۵۰-۵۴) gəlibdir ki, belə ".oxuyuruq: "Firon öz camaatını kiçik sanıb təhqir etdi

Bəzi tarixçilər yazıblar: Fironun təşkilatı o dərəcədə geniş və əhatəli idi ki, Musa və Harun (əleyhissalam) iki ilə onun qəsrinə get-gəl etmişsələr də qapıçılar onlara əsla etina göstərmir, təəccüb edirdilər ki, bu iki nəfər bu sadə vəziyyətlə necə istəyirlər "!?Fironun xidmətinə yetişsinlər

Heç kəsin də cür"əti yox idi ki, bu iki nəfərin vəziyyətini Firona bildirsin. Təsadüfən bir gün bir təlxək xoşməzəlik xatirinə Fironun yanına gələndə gözlənilmədən Musa (əleyhissalam)-ı gördü. O Musadan eşitdiyi sözü Firon güldürmək üçün söylədi. Bir kişi qəsrin qapısının kənarına gəlibdir ki, böyük qəribə sözlər söyləyir. O buna mötəqiddir .ki, səndən başqa məbud yoxdur

Firon fərman verdi ki, Musanın içəri daxil olmasına icazə versinlər. İcazə alan Musa (əleyhissalam) qardaşı Harunla Fironun yanına gəldi Fironu Musaya baxıb dedi: "Sən "?kimsən

".Musa buyurdu: "Mən dünyanı Yaradanın elçisiyəm

Firon Musaya heyrətlə baxdıqda onu tanıyıb dedi: Sən müddətlər bizim yanımızda idin sən bizim dinimizdə kafir oldun. Sən xətakar və yolunu azmışlardansan. Bu mətləb .“Şüəra” surəsinin ۱۶-۲۲-ci ayələrində gəlibdir

## ALTMIŞ ÜÇÜNCÜ HEKAYƏT – Xəvariclərin başçısının öldürülməsi

Zussədyə (iki döşlü) adı ilə məşhur olan iki əmcəkli Hərqus ibni Zühəyr Xəvaric .firqəsinin əsasını qoymuşdu. Onu Muxdəc də adlandırırdılar

Onun keçmişi barədə belə deyirlər ki, Hunəyn müharibəsində (hicrətin səkkizinci ilində İslam ordusu ilə küfr ordusu arasında Taifdə baş verdi) müsəlmanlar qalib gəldikdən sonra bitib-tükənməz qənimətlər ələ keçirdilər. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm müsəlmanlar arasında qənimətləri bölüşdürməklə məşğul olduğu halda birdən həmin Hərqus (bəni-Təmim qəbiləsindən idi və onu Zul-Xuvəysərədə adlandırırdılar) Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin yanına gələrək tam alçaqlıqla ona belə ".dedi: "Ya Rəsulullah, ədalətə riayət et

:Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu

Vay sənə, əgər mən ədalətə riayət etməsəm onda bəs kim ona riayət edəcək!?"" Ömər ibni Xəttab Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən onu öldürmək üçün icazə istədikdə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: Onu öz halına buraxın onun səhabələri vardır ki, əgər onların oruc və namazını görsəniz öz .oruc və namazınızı kiçik sanarsınız

Onların həmişə Quran oxumasına baxmayaraq Quran boğazlarının sərhəddindən çölə çıxmır. Onlar oxun kamandan çıxdığı kimi İslamdan çıxacaqlar, onların puç əqidələri vardır. (Onların başçıları) qara sifətli bir nəfərdir ki, biləklərində qadın döşünə oxşayan ət parçası vardır. Əgər onu tərpətsən, irəli-geri hərəkət edər. O, öz səhabələrinə tərəf .gəlib onları da İslamdan döndərəcəkdir

İmam Əli (əleyhissalam) bu şəxsi Nəhrəvan müharibəsində qətlə yetirib. O, Qasiə :xütbəsinin birində buyurur

Burada "Şeytan rədhəh" kəlməsi su yığılan qala mənasındadır. Belə ki, o Nəhrəvan davasında bir çalaya düşüb ölmüşdü "Səqəh"dən məqsəd saiqə yəni ilğım, hündür səs və pələng nərəsi idi ki, Əli (əleyhissalam) çəkmişdi. Bu nə"rə Zus-sədyəni elə qorxu və vəhşətə salmışdı ki, tələsik olaraq qaçmış ona heç bir silah toxunmamış çalaya düşüb .ölmüşdü

Onun haqqında belə deyilib: Əli (əleyhissalam)-ın ordusu Nəhrəvan Xəvaricinin mühاribəsinə çatıb onlarla vuruşduqda ۹ nəfərdən başqa hamısı öldürüldülər. :Müharibədən sonra Əli (əleyhissalam) belə buyurdu

Xəvaric meyidlərinin arasını gəzin, görün ki, Muxdəc Zus-sədyə öldürülüb ya yox? Bir dəstə ölənlərin arasında nə qədər axtarış apardısa da onu tapmadı. Hadisəni Əli (əleyhissalam)-a çatdırdıqda Həzrətin özü öldürülənlərin arasına gəldi. Onların cəsədləri üst-üstə tökülmüşdü. Həzrət meyyitləri kənara yığdıqda onların içindən Zus-:sədyənin napak cəsədini tapıb buyurdu

Allahu Əkbər! Mən heç vaxt Məhəmməd səlləllahu əleyhi və alihi və səlləmə yalan" nisbəti verməmişəm". Çünki, Əli (əleyhissalam)ın Zus-sədyəni öldürəcəyini Peyğəmbər hələ qabaqcadan xəbər vermişdi. Əli (əleyhissalam) kənara çəkilib şükr səcdəsi yerinə yetirdi. Daha sonra atına minərək düşmən ölülərinin arasından keçdiyi zaman buyurdu: "Sizi məğrur edən beləcə həlakət torpağına atdı." Həzrətdən sual etdilər. "Ya "?Əli (əleyhissalam) onları kim məğrur etdi

”.Buyurdu: “Şeytan və pis həvəslər

## ALTMIŞ DÖRDÜNCÜ HEKAYƏT – ƏLİ (Əleyhissalam)–ın üşaqlığı

:Əli (əleyhissalam) Qasiə xütbəsində (“Nəhcül-bəlağə”nin ən uzun xütbəsi) buyurur

Yeniyetməlik dövründə ərəb igidlərini yerə sərdim və iki qəbilənin–Rəbiy”ə və Müzirin“ uca budaqlarını sındırdım. Siz mənim Peyğəmbərlə səlləllahu əleyhi və alihi və səlləm .qohum olduğumu və onun məktəbinə olan bağlılığımı yaxşı bilirsiniz

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm məni özü tərbiyə edib. Uşaq vaxtımda Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm məni öz doğma övladı kimi ağuşuna sıxıb, öz xüsusi istirahət otağında saxlayırdı. Ona elə yaxın idim ki, Həzrətin gözəl və xoş iyini duyub hiss edirdim. O xörəyi çeynəyib ağzıma qoyurdu. Həzrət məni heç vaxt yalan danışan görmədi eləcə də heç vaxt məndən bir səhv tutmadı. Həzrət Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmi uşaq vaxtı süddən ayırdıqları zaman Allah ən böyük mələyini Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmi gecə gündüz böyüklük, doğruluq və yaxşı əxlaqa sövq etməkədən ötrü göndərdi. Mən təzə doğulmuş, həmişə anasının dalınca düşən dəvə balası kimi onun ardınca gəzirdim. Həzrət hər gün əxlaqdan mənə yeni-yeni hikmətlər aşkar edərək onun xəttində .irəliləməyimi tövsiyə edirdi

Həzrət Peyğəmbər ilin bir müddətini Həra dağında keçirirdi. Məndən başqa heç kəs onu görmürdü. O günlər İslam dini naminə Peyğəmbər səlləllahu əleyhi və alihi və .səlləm öz evində idi

Xədicdən sonra ٣-cü müsəlman mən idim. Biz İslamı qəbul etmişdik. Mən vəhy və risalət nurunu görürdüm. Xoş və ürək açan Peyğəmbərliyin iyini hiss edirdim. Peyğəmbərə vəhy nazil olan zaman şeytanın naləsini eşitdikdə Həzrətdən soruşdum: ”!?“Bu kimin ağlamasıdır

Buyurdu: Bu şeytandır, ibadətinin mükafatından məyus olub və elə ona görə də nalə :edir. Bu zaman Həzrət belə buyurdu

Ya Əli! Mən eşitdiyimi duyur mən gördüyümü isə görürsən. Sən təkcə Peyğəmbər“

".deyilsən, lakin mənim vəzirimsən. Sən səadət və xeyr yolundasan

İndi isə Əli (əleyhissalam)-ın yeniyetməlik çağında Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmi necə himayət etməsi barədə tarixi faktları yığcam da olmuş olsa nəzərinizə çatdırırıq. Həzrət Əli (əleyhissalam)-ın İslamı qəbul etdiyi vaxt təqribən on yaşı olardı. .Əli (əleyhissalam)-ın ləqəblərindən biri də Quzəmdir

Bir hədisdə İmam Sadiq (əleyhissalam)-dan bu barədə belə soruşdular. Niyə Əli ?(əleyhissalam)-a bu ləqəbi verdilər

:Həzrət cavabında buyurmuşdu

Besətin əvvəlindən müşriklər uşaqlara Peyğəmbər səlləllahu əleyhi və alihi və“ səlləmə daş atmalarını tapşırmışdılar.” Həzrət də hər vaxt evdən çölə çıxsaydı uşaqlar onu daşa basırdılar. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmvəziyyəti Əli (əleyhissalam) üçün (o vaxt yeni-yetmə idi) danışdıqda Həzrət Əli (əleyhissalam) ərz .etdi: Atam, anam sənə qurban. Həmişə evdən çıxdıqda mənə də xəbər ver

Bir gün Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm Əli (əleyhissalam)-la evdən bayıra çıxdıqda uşaqlar həmişəki adətləri üzrə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmə tərəf daş atmağa başladılar. Bu zaman Əli (əleyhissalam) onlara tərəf gələrək əlinə keçəni döyürdü. Uşaqlar da ağlaya ağlaya atalarının yanına gedib deyirdilər: “Əli bizi döydü, o bizi vurdu.” Məhz bu hədisdən sonra o Həzrətə Quzəm (quzğun ağırlığı) .dedilər

## ALTMIŞ BEŞİNCİ HEKAYƏT – Müşriklərin tərsliyi

Besətin başlanğıcında Qüreyş başçılarından və şirk qabaqcıllarından bir dəstə adam :Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin hüzuruna gəlib dedilər

Ey Muhəmməd! Sən elə bir iddia etmisən ki, atalarından və ailəndən heç biri belə bir“ .”.iddianı (Peyğəmbərlik iddiasını) etməmişdir

Biz səndən bir möcüzə görmək istəyirik. Əgər yerinə yetirsən sənin haqq Peyğəmbər olub öz iddianda sadiqliyinə inanacaq, əks halda isə cadugər və yalançı olduğunu biləcəyik-dedilər: (köhnə və yoğun bir ağaca işarə edib) dedilər: “Bu ağacı səslə, qoy öz ”.kökündən çıxıb irəli gələrək müqabilində dursun

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: Allah hər şeyə qadirdir. Əgər Allah sizin bu istəyinizi yerinə yetirsə ona iman gətirəcəksiniz? Dedilər: Bəli

Buyurdu: Tezliklə sizin istədiyinizi sizə göstərərəm, amma mən bilirəm ki, siz səadətə

doğru qayıtmayacaqsınız. Sizin aranızda elə bir adam vardır ki, Bədr quyusunun (Bədr müharibəsindən sonra) içərisinə atılacaqdır. Eləcə də biri də vardır ki, hizblər müharibəsini ortaya salacaqdır. Bunu dedikdən sonra Həzrət həmin ağacı səslədi. "Ey ağac! Əgər Allah və cəza gününə imanın varsa, əgər məni Allahın Peyğəmbəri bilirsənsə, Allahın izni ilə kökünlə birgə yerdən çıx və qarşımda dur."

İmam Əli (əleyhissalam) buyurur: “And olsun o Allaha ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmi haqla məbus edib, ağac kökü ilə birgə yerdən çıxıb qabağa gələrək şiddətlə səslənir, uçan quşlar kimi budaqlarını yellədirdi. O öz budaqlarından bəzisini Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin üstünə saldıqda mən də Həzrətin sağ ”.tərəfində durmuşdum

:Qüreyş başçıları bu vəziyyəti müşahidə etdikdə təkəbbür və qürur üzündən dedilər

Ağaca əmr et ki, yarısı qabağa gəlib başqa yarısı isə öz yerində dursun.” Peyğəmbər“ səlləllahu əleyhi və alihi və səlləm həmin əmri verdikdə ağacın yarısı qəribə vəziyyətdə .uca səslə elə yaxınlaşdı ki, az qaldı Həzrətə yapışsın

:Şirk başçıları yenə də təkəbbür və qürur üzündən dedilər

Əmr et ki, ağacın bu yarısı qovuşsun! Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm həmin əmri verdikdə ağac yenə də əvvəlki vəziyyətinə qayıtdı. Əli (əleyhissalam) buyurdu: “La ilahə illəllah. Ey Peyğəmbər! Mən ilk nəfərəm sənin Peyğəmbərliyinə iman gətirirəm. İlk nəfərəm ki, bu ağacın Allah fərmanı ilə sənin nübüvvət və dəvətini böyük tutmaq üçün istədiyini yerinə yetirməsini etiraf edirəm.” Amma şirk və Qüreyş başçıları :dedilər

Muhəmməd sehrbaz və yalançıdır. Onun qəribə sehri vardır ki, öz sehrində böyük“ məharət sahibidir.” Və dedilər: Görəsən Muhəmməd səlləllahu əleyhi və alihi və səlləmin Peyğəmbər olmasını mənim kimilərdən başqa (mənə işarə) kim təsdiq edir?! Amma mən isə məzəmmət edənlərin məzəmmətindən qorxan deyiəm. Belə adamların siması sadiqlərin simasıdır. Onların dedikləri yaxşıların dedikləridir. Gecəni səhər edənlər günün işıq bağışlayanlarıdırlar. Quranın xəttini eləcə də Peyğəmbərin sünnətini əbədi yaşadanlar onun yolu ilə gedənlərdən olurlar. Onlar təkəbbür, qürur, fəsad və xəyanətdən uzaq olurlar, qəlbləri behiştdə, qədəmləri isə İlahi vəzifə və məs”uliyyəti yerinə yetirməkdədir. Bu idi tarixin dilavər, mərd qissəsi. Söz və bəyan əmiri, iman və səlabət sahibi Əli (əleyhissalam)-ın çöhrəsi gül kimi təravətli, polad təki .möhkəm və əyilməz şəmşir, şəffaf bulaq kimi qələbəyə malik idi

**ALTMIŞ ALTINCI HEKAYƏT – Qəlbi pak cavan**

Əli (əleyhissalam)-ın dostlarından birinin adı Həmmam idi ki, Əli (əleyhissalam)-ın təmiz qəlbli şiələrindən hesab olunurdu. Bir gün Həmmam İmam Əli (əleyhissalam)-ın yanına gəlib Həzrətə ərz etdi: “Mənim üçün pərhizkarların sifətini bəyan et, elə vəsf et ”.ki, onların parlaq simalarını öz gözlərimlə gördüyümü zənnə edim

İmam onun cavabında sükut etdi. Bir neçə dəiqədən sonra Həzrət onun sualına qısa :cavab verib buyurdu

:Ey Həmmam pərhizkar ol yaxşı işlər gör ki, Allah buyurur

(sahibləri ilədir.” (“Nəhl” surəsi, ١٢٨

Həmmam təkcə bu cavabla kifayətlənmədi Həzrətin bu barədə çox söz danışmasını .israr etdi

Elə buna görə də İmam onun üçün (onun simasında bütün şiələri üçün) pərhizkarların, :habelə onların yüksək sifətləri barəsində geniş şəkildə danışmağı qərara alıb buyurdu

...Onların birinci xüsusiyyəti budur ki, dedikləri düz və səhihdir

Beləliklə, Həzrət bu xüsusiyyətlərdən otuza yaxın qeyd etdikdən sonra onların son cəhətlərini belə bəyan etdi: “Onların adamlara yanaşması yalan və hiylə üzündən ”.olmayacaqdır

.Söz bura yetişdikdə Həmmam nalə çəkib dünyadan getdi

İmam buyurdu: “Ah, mənim qorxum elə bundan idi.” (yəni İmam əvvəldən bilirdi ki, Həmmam dözməyəcək, qorxurdu ki, ölə bilər, ona görə də Həzrət ilk növbədə .(danışmaq istəməmişdi

”.Yetgin nəsihətlər bu cür qəlbi nəsihət qəbul edənlərə təsir edir“

”?Bir şəxs dedi: “Ya Əli! Bəs niyə belə deyilsiniz, Həmmam kimi təsir altına düşəsiniz

İmam cavabında buyurdu “Vay olsun sənə, hər əcəlin müəyyən vaxtı var, sakit ol bir :də söz danışma. Bu sözü şeytan sənin dilinə gətiribdir.” Daha aydın ibarətlə

Allahın buyurduğu belə imiş ki, Həmmam bu səbəblə dünyadan getməlidir və o belə bir ölümə layiq idi. Ancaq mənim barəmdə isə mümkündür mənim ölümümün şəhadət .ləyaqəti olsun ki, bundan daha yüksəkdir

## ALTMIŞ YEDDİNCİ HEKAYƏT – Əli (ə)–ın Peyğəmbər (s) olan bağlılığı

Xain insanların qurduğu müxtəlif hiylələr nəticəsində İraq ordusunun qəlbi Əli (əleyhissalam)-a qarşı nifrətlə dolmuşdu. Öz asayişlərini təmin etmək xatirinə Əli

(əleyhissalam)-ın xəttində hərəkət etməyə nail olmayan həmin adamlar gərəksiz sülh və müqavilə bağlamağı müharibədən üstün sayırdılar. Bu vaxt Əli (əleyhissalam)-ın zalımlarla müharibə etməkdən ötrü camaata öz fəzilətlərindən bəyan etməsi, habelə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmla olan qırılmaz əlaqəsini xatırlamağı lazım idi. Belə ki, düşmənlərin zəhərli təbliğatları təsirsizləşərək məhv olsun və haqq arayıb Allahdan qorxan adamlar onun ətrafına toplaşaraq fasidlərin məhvində və hər cür fəsadın yox edilməsində Həzrətə kömək etsinlər. Həzrət, Peyğəmbər yolunda candan keçməyə hazır olduğunu və onunla olan bağlılığı barədə belə buyurdu: "İxlaslı əshab və

nübüvvətin sirrini saxlayanlar yaxşı biirlər ki, mən hətta bir dəqiqə olmuş olsa belə Allah və peyğəmərə qarşı çıxmamış, əksinə, həmişə canımdan keçməyə hazır olmaqla müharibə səhnələrində o Həzrətin hüzurunda hazır olmuşam. Mən olduğum cəbhələrdə qorxudan qəhrəmanların qıçları əsib, titrəyir qaçmağı qalmaqdan üstün və vacib sanırdılar. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin yolunda olan hazırlığımla o Həzrətə demək olar ki, sözün əsl mənasında qardaşlıq etdim. Allah isə məni bu müvəffəqiyyətimə görə əziz sandı. Peyğəmbərin başı sinəm üstündə olduğu zaman ruhu bədənindən uçub qəlbi həmişəlik dayandı. Bu zaman əlimi üzünə çəkdim. Həzrətin bədəninə qüsl verdiyim zaman bu işdə mələklər də mənə kömək edirdilər. Onun vəfatı ilə əlaqədar hətta evinin qapısı və divarları belə nalə və fəryada gəlmişdilər. Mələklər dəstə-dəstə yerə enib göyə qalxmaqda idilər, və mənim qulaqlarım onların Həzrətə qıldıqları namazın ahəstə səsindən dolmuşdu, o vaxta qədər ki, onu torpağa tapşırdım. İndi deyin görüm, kim Peyğəmbərə həm diriliyində həm də rehlətindən sonra daha yaxın və layiqli idi. (Buna görə də mən onun xəttində hərəkət edir, o Həzrətin yolunu davam etdirirəm). Uzaq görənlik və ağlınızla cihada !sarı hərəkət edin. Öz niyyətinizi əməl və cihad yolunda mübarizə etməklə doğruldun

And olsun tək Allaha, mən haqq yolundayam, lakin onlar (müxaliflər) yollarını azaraq" batil uçuruma yuvarlanacaqlar. Özümə və sizə Allahdan bağışlanmağımızı arzu ".edirəm

## ?ALTMIŞ SƏKKİZİNCİ HEKAYƏT – Siyasətçi kimdir

Müaviyə zor və hiylə gücünə qabağa irəliləyirdi. Hətta Siffeyn müharibəsində hiylə ilə .Quran varaqlarını nizə başına keçirməklə Əli (əleyhissalam)-ın ordusuna təfriqə saldı

:Elə buna görə də bir qrup avam deyirdi

Müaviyə Əli (əleyhissalam)-dan daha siyasətçidir." Tarixdə də bu sual dəfələrlə təkrar " .olunmuşdu

!?Müaviyə siyasət qumarında niyə uddu

İmam Əli (əleyhissalam) bu suala cavab verərək öz danışıqlarının birində belə :buyurmuşdu

And olsun Allaha, Müaviyə məndən zirək və siyasətli olmayıb. O, yalnız hiylə və“ fırıldaqlara əl ataraq günaha mürtəkib olub.” Əgər hiylə bəyənilmiş olsaydı mən bütün camaatdan daha siyasətli sayılardım. Ancaq hər hiylə bir günahdır ki, hər günah da küfrün bir növüdür. Qiyamət günündə hiyləgər və fırıldaqçılar öz xüsusi bayraqları ilə .gələcəklər, onlar məhz o bayrağın vasitəsilə tanınacaqlar

Belə bir sualın ortaya çıxması mümkündür: “Əgər Əli (əleyhissalam) ayağını İslamdan götürməyib işlərdə hiylə gəlməklə nəzər etməsəydi hiyləgərin hiyləsində aldanmazdı ?və hiyləgərin hiyləsini hiyləgərin özünə qaytarmalıydı.” Bəs bu necə olan işdir

:İmam Əli (əleyhissalam) bu sualın cavabında buyurdu

”.And olsun Allaha ki, mən fırıldaq və hiyləyə aldanmaram“

Əgər İraq ordusu süstlük və səhlənkarlıq göstərməyib İmamın dönə-dönə buyurduğu əmrlərinə qulaq assaydı Müaviyənin bütün hiylələri suya dönüb əriyərdi. Halbuki, heç .vaxt hiyləyə aldanıb qəflət etmədi. O öz vəzifəsini necə lazımdırsa yerinə yetirdi

## ALTMIŞ DOQQUZUNCU HEKAYƏT – Əli (Əleyhissalam) Zəhra (Əleyha salam)–ın qəbri yanında

İmam Əli (əleyhissalam) günorta namazını məsciddə qıldıqdan sonra evə tərəf gəldiyi vaxt gözlənilmədən Fizzə və Əsma bint Uməys ilə qarşılaşdı. Onlar çox qəmgin halda :ağlayırdılar Həzrət sual edib soruşdu

Nə olub, niyə ağlayırsınız?” Ərz etdilər: “Ya Əmirəl-möminin! Əmin qızı Həzrəti Zəhra“ ”.(əleyhissalam)-nı axtar onu diri görəcəyinə gümanımız yoxdur

Həzrət Əli (əleyhissalam) tələsik evə gəldi, otağa girdikdə Həzrəti Zəhranın (əleyhissalam) yatağı üstündə düşüb sağa-sola burularaq çabalamasını gördü. Xanım Zəhra (əleyhissalam)-nın başını diz üstünə alıb belə səslədi: “Ya Zəhra!” Cavab gəlmədi. Yenə də səslədi: Ey Rəsulullahın səlləllahu əleyhi və alihi və səlləmin qızı! Zəhradan yenə bir cavab eşitmədi. Yenə səslədi: Ey Əbasının altından yoxsullara zəkat paylayanın qızı. Ondan bir səs eşitmədi. Həzrət belə səslədi: Ey o kəsin qızı ki, göydə mələklər dəstə-dəstə onunla namaz qılırdılar. Yenə xanımdan bir cavab eşitmədikdə .Həzrət belə çağırdı

!Ya Fatimə! Mənəm, əmin oğlu Əliyyibni Əbi Talibəm-aç gözünü mənimlə danış

Həzrəti Zəhra (əleyhissalam) gözlərini açıb Əli (əleyhissalam)-ı başı üstündə gördükdə .Həzrətin üzünə baxıb ağlamağa başladı. Əli (əleyhissalam)-da ağladı

İmam Əli (əleyhissalam) buyurdu: Ya Zəhra! Səni niyə belə görürəm, nə olubdur sənə? Mən ki, sənin əmin oğlu Əliyəm. Cavab ver, ya Zəhra. Zəhra (əleyhissalam) buyurdu: Əmi oğlu mən özüm də hiss edirəm, bilirəm ki, məndən sonra evlənəcəksən. O, vaxt öz gecə-gündüzünü iki hissəyə bölərsən. Bir gün və bir gecəni gələcək həyat yoldaşına və bir gün bir gecəni isə övladlarıma ayırarsan. Övladlarımın qabağında Həsən və Hüseyn (əleyhissalam)-nin üstünə qışqırma. Onlar iki qəlbi sınıq

yetim və qəribdirlər. Öz babalarını əldən vermələri bir neçə gündən artıq deyildir ki, bu gün də analarını əldən verirlər. Onlarla düşmən-çilik edib onları öldürən ümmətə vay .olsun

Sonra Zəhra (əleyhissalam) bir-bir öz vəsiyyətlərini söyləməyə başladı. Xanım Zəhra can yandırıcı bir vəziyyətdə dünyadan köçdü, Əli (əleyhissalam) Zəhra (əleyhissalam)-ın öz vəsiyyətinə əsasən gecə ikən qüsl verib, kəfənlədi. Xanıma meyyidə namazı qılaraq onu torpağa tapşırdı. Qəbri torpaqla örtdüyü zaman Həzrəti qəm bürüdü göz yaşının damcıları sel kimi üzünə axırdı. Bu halda üzünü Peyğəmbər səlləllahu əleyhi və :alihi və sölləmin qəbrinə tərəf tutub belə buyurdu

Salam olsun sənə, ey Allahın elçisi! Öz tərəfimdən və elə indicə mehmanın olan qızın“ ”.tərəfindən salam olsun sənə

Ey Allahın Peyğəmbəri! Səbrim sənin sevimli qızının fərağından azalıb, taqətim isə əldən gedibdir. Lakin sənin o böyük faciəli vəfatını gördükdən sonra mənə yetişən hər bir müsibət kiçikdir. Öz əlimlə cəsədini qəbrə qoyduğumu və rehlət edərkən başını .sinəm üstünə aldığımı heç vaxt unuda bilmərəm

Ey Peyğəmbər, mənə tapşırdığın əmanəti sənə qaytardım. Mənim qəmim isə əbədidir. Bundan belə gələcək gecələrimi ayıqlıqla başa vuraram ki, birgə sənə qovuşum. Tezliklə qızın səni agah edəcəkdir. Sənin ümmətinin zülm etmək üçün necə birləşdiglərini qızın sənə danışacaqdır. Halımın necəliyini ondan soruş... Mənim .salamım olsun, sizin hər ikinizə! sizə vida salamı edirəm

## YETMİŞİNCİ HEKAYƏT – Haqq tərəfdarına rəhmət

Təlhə və Zübeyr iki nəfər Qüreyşin məşhur Peyğəmbəri böyük əshablarından hesab olunurdular. Bu iki nəfər Osmanın ölümündən sonra Həzrət Əli (əleyhissalam)-la beyət .etmədə ilk adamlardan sayılırdılar

Camaatın Əli (əleyhissalam)-la beyət etməsində bu iki nəfərin xüsusi rolu olmuşdur. Lakin Həzrət Əli (əleyhissalam) xilafətə keçdikdən sonra işlərə İslami ədalətlə başladı. Bu iki nəfər bəzi məsələlərdə xüsusilə də iki məsələdə Əli (əleyhissalam)-a qarşı etiraz səslərini ucaltdıqda nəticəsi Əli (əleyhissalam)-la bu iki nəfər arasında olan

.münasibətlərin pisləşməsinə gətirib çıxartdı

Deyirdilər: Niyə Əli (əleyhissalam) ölkənin siyasi məsələlərində bizimlə-۱ ?məsləhətləşmir

Deyirdilər: Niyə o Həzrət beytül-malın bölgüsündə bizimlə başqaları arasında fərq-۲ qoymur, hamını bir gözdə görərək beytül-malı bərabər şəkildə bölür.? Bir halda ki, biz islamın sabiqəli şəxsiyyətlərindən hesab olunuruq və s... Əgər siyasət hiylə və aldatma mənasında olsaydı, Əli (əleyhissalam) gərək onları öz qanadı altına alıb ağızlarını yummalarından ötrü onlara rüşvət də

verməliydi. Lakin İslamdakı siyasət işlərin ədalət və islami tədbiri əsasında bölün-məsidir. Elə buna görə də artıq pay tələb edənlərə gözü yummaq olmaz. Habelə .başqasının haqqı onlara verilməməlidir

:İmam Əli (əleyhissalam) bu iki nəfərin etirazının cavabında belə buyurdu

Siz cüz"i işlər ucbatından qəzəblənib bir çox yaxşılıqları görməməzliyə aldınız." Mümkündür. mənə sizin hansı haqqınızı tapdadığını söyləyəsiniz? Ya sizin hansı !?payınıza yiyələnməyimi deyəsiniz

Ya müsəlmanlar tərəfindən edilən hansı haqq və şikayəti gətiriblər və mən də o işə baxmaqda acizlik göstərmişəm? Yaxud deyə bilərsinizmi hansı İlahi hökmdən "?xəbərsizəm ki, onun yolunda səhv etmişəm

Sonra xilafət və rəhbərlik mövzusunda ki, Həzrətin öz haqqından və camaatın özü o :Həzrətin bu vəzifəni seçməsini istəmişdilər, işarə edib axırda buyurdu

Allah haqqı görüb ona kömək edənlərə, zülmü gördükdə isə onu rədd edərək haqqı öz" ".sahibinə qaytaranlara rəhmət etsin

## İKİNCİ BÖLÜM

### YETMİŞ BİRİNCİ HEKAYƏT.ƏDƏB VƏ HƏYA QAYDALARINA RİAYƏT

Hücr ibni Ədi və Əmr ibni Həməq İmam Əli (əleyhissalam)-ın şücaətli və vəfalı silahdaşları idilər. Onlar Siffeyn mühari-bəsində Şam ordusundan zara gəldiklərini .izhar edir və onlara nalayiq sözlər deyirdilər

Bu xəbər İmam Əli (əleyhissalam)-a çatdı. İmam onlara sifariş göndərdi ki, nalayiq sözlər danışmayın və təhqir edici sözlər söyləməyin. O iki nəfər Əli (əleyhissalam)-ın "?hüzuruna gəlib ərz etdilər: "Məgər biz haqq deyilik

"İmam buyurdu: "Haqqıq

Ərz etdilər: "Məgər Şam ordusu (Müaviyənin silahdaşları) batil xəttində deyildirlər?" ".İmam buyurdu: "Bəli, onlar batildirlər

”?.Ərz etdilər “Bəs, niyə bizi onlra nalayiq sözlər deməkdən çəkindirirsən

:İmam buyurdu

Mən sevmirəm ki, siz nalayiq sözlər söyləyəsiniz. Amma əgər onların əməllərini ifşa“ etmiş və onların yoldan çıxmalarını söyləsəydiniz dedikləriniz daha düz və üzrünüz qəbul olunardı.” Sonra buyurdu: “Gərək pis sözlər demək əvəzinə belə dua

edəydiniz.” “İlahi! bizim və onların qanını hifz et! Bizimlə onların arasını düzəlt, və onlara yol azmaqdan nicat ver, bundan ötəri ki, xəbərsizlər haqqı tanısınlar və haqq ilə ”.düşmənçilik edənlər özlərinin bu pis əməllərindən əl götürsünlər

Əsəri toplayan deyir: “Qurani məciddə “Ən”am” surəsinin ١٠٨-ci ayəsində belə :oxuyuruq

Allahdan başqasını məbud seçənləri söyməyin, əks halda onlar da zülm və cəhalət“ ”.üzündən Allahı söyələr

Bəzi rəvayətlərə görə möminlərdən bir çoxunun bütpərəstlər və onların əməllərindən şiddətli surətdə narahatlıqları olduğuna görə onları bütlərinə təhqir edici sözlər deyirdilər. Belə bir vaxtda Quran yuxarıkakı ayə ilə aşkarcasını onların bu məsələdən .çəkindirdi

Beləliklə görürük: “Nəhcül-bəlağə” və Quran əmr edirlər ki, müsəlmanlar hətta .düşmənlərin müqabilində belə ədəb və həya üsullarına əməl etsinlər

Çünki, söyüş və pis sözlər ilə yolunu azmışları haqqa tərəf sövq etmək mümkün deyil, əksinə, bu iş düşmənin daha da tərsləşməsinə səbəb olacaqdır. Beləliklə məlum olur .ki, gərək insanlar məntiq, dəlil və nəzakətli əxlaqla, İslama doğru cəzb olunsunlar

## YETMİŞ İKİNCİ HEKAYƏT.HƏSƏN VƏ HÜSEN (ƏLEYHİMƏSSALAM) SİFFEYN MÜHARİBƏSİNDƏ

Əli (əleyhissalam)-ın ordusu ilə Müaviyənin qoşunu arasında baş verən Siffeyn müharibəsi ١٨-ay davam etdi. Bu döyüşdə Əli (əleyhissalam) ilə yanaşı Həsən və Hüseyn (əleyhissalam) Məhəmməd ibni Hənəfiyyə və Həzrət Abbas (əleyhissalam) da .fəal iştirak edirdilər

İmam Həsən (əleyhissalam)-ın rəhbər seçiləcəyi, eləcə də nəslinin hifzi Həsən və Hüseyn (əleyhissalam) ilə bağlı olması səbəbləri üzündən Əli (əleyhissalam) Peyğəmbərin gözünün işığı olan bu iki nəfərin öldürülməsindən çəkinirdi. Elə buna görə :də Həzrət buyurdu

Ey Möminlər! Məni araya salmaq əvəzinə bu cavanı (oğlumu) dərk edin. Məbada onun“ şəhadəti məni pərişan edər, uca ümid hasarımı sındırar, ona görə ki, mən bu iki nəfərin ölümü barədə (Həsən və Hüseyn) heyfislənirəm, Məbada onların şəhadəti ilə ”.Peyəğəmbər nəslini kəsmiş olasınız

Məhəmməd Hənəfiyyə də Əli (əleyhissalam)-ın oğlanlarından idi. Bir şəxs ondan soruşdu: "Niyə atan səni müharibə meydanına göndərirdi və bu barədə israr edirdi, amma Həsən və Hüseyn (əleyhissalam)-a qarşı isə belə deyildi".

O cavabında dedi: "Ona görə ki, Həsən və Hüseyn (əleyhissalam) atamın iki gözü kimidirlər, atam əlləri ilə gözlərini qoruyurdu və mən atamın sağ əliyəm".

Burada Hüseyn (əleyhissalam)-ın Peyğəmbərin övladı olması barəsindəki dastana diqqət yetirmək yerinə düşərdi.

Həccac ibni Yusif Səqəfi Əbdül Məlikin Kufədəki qan içən valisi idi. Onun şiələr və Əmirəl-Möminin Əli (əleyhissalam)-ın dostları ilə qatı düşmənçiliyi var idi. Və hətta bir nəfərin şiə olması və Əli (əleyhissalam)-dan tərəfdarlıq etməsi zənni kifayət idi ki, onu qətlə yetirsin.

Deyir: Bir gecə Həccac məni istədi, hürəkək oldum və durub yanına otağa daxil olduqda birdən onun kənarında sərilmiş dəri süfrəni ki, adamları onun üstündə öldürürdü və iti bir qılıncı gördüm. Salam verdim.

Salamımın cavabını verib dedi: "Qorxma, sənə bu gecə sübhə qədər aman verdim". Sonra məni öz yanında əyləşdirib cəlladlarından birinə işarə etdi.Cəllad zəncir və iplə bağlanmış bir kişini gətirdi və Həccacın müqabilində saxladı. O vaxt Həccac üzünü mənə tutub dedi:

Bu şeyx Səid ibni Cubəyr deyir: Həsən və Hüseyn ikisi Peyğəmbərin övladlarıdırlar." Gərək bu barədə Qurandan dəlil gətirsin, yoxsa bu dəqiqə (bu qılıncla bu dərinin üstündə) başını bədənindən ayıracağam. Dedim: onda onu zəncir və ipdən azad edin əgər Qurandan dəlil gətirdi ki, heç azad olub getsin. Yoxsa, bu qılıncla zənciri kəsmək olmaz. istər-istəməz bu zəncirlər onun bədənindən ayrılmalıdır ki, onda onu öldürmək mümkün olar. Həccac mən dediyimi etdi: Kəndir və zənciri onun bədənindən ayırdıqdan sonra diqqətlə baxdıqda onun (Quran təfsirçisi və İmam Səccad (əleyhissalam)-ın xüsusi şagirdi) Səyid ibni Cübəyr olduğunu görüb kədərləndim. Öz-özümə dedim:

Həsən və Hüseyn (əleyhissalam)-ın Peyğəmbərin övladları olması barəsində neçə dəlil gətirmək olar.? Birdən Həccacın səsi yüksəldi və Səid dedi: Həsən və Hüsyen (əleyhissalam)-ın Peyğəmbərin övladları olmalarını iddia edirsən, bunun dəlilini söylə, ."yoxsa boynunu vuracağam

Səid dedi: "Mənə möhlət ver". Həccac bir neçə dəqiqə sükut etdi və bir də dedi: "Dəlilini gətir!" Səid dedi: "Bir az möhlət ver". Həccac bir neçə dəqiqədən sonra, üçüncü dəfə dedi: "Sənə deyirəm Qurandan dəlilini gətir. Necə demək olar ki, Həsən və Hüsyen ."(əleyhissalam) Peyğəmbərin övladlarıdırlar

:Səid bir az fikirləşdi və dedi

Və İshaq və Yəqubu ona (İbrahimə) bağışladıq və hər birini düz yola saldıq və Nuhu" (da) qabaqcadan hidayət etdik və onun (İbrahimin) övladlarından Davud, Süleyman, Əyyub, Yusif, Musa və Harunu (hidayət) etdik və yaxşı əməl sahiblərinə belə mükafat ".veririk və (həmçinin) Zəkəriyya, Yəhya, İsa, İlyası da. Hamısı salehlərdən idilər

Səid bu ayələri oxuduqdan sonra dedi: Burada İsanın adı və hansı ünvanla gəlmişdir! :Həccac dedi

.İbrahimin övladları ünvanıyla

Səid dedi: İsa (əleyhissalam)-ın atası olmadığı halda yenə də İbrahim (əleyhissalam)-ın övladı hesab olunur. Çünki İsa Məryəmin və Məryəm də bir neçə vasitə ilə oğlu İbrahim (əleyhissalam)-ın qızı hesab edilir. Buna görə də İsa (əleyhissalam) İbrahim .övladı kimi tanınmışdır

Buna görə də demək olar ki, Həsən və Hüseyn İslam Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləmin övladlarıdırlar. Çünki, anaları Peyğəmbər səlləllahu əleyhi və alihi və .səlləmin müstəqil övladıdır

Həccac bu dəqiq və möhkəm dəlildən qane oldu. Əmr etdi ki, Səid ibni Cubeyrə on min .dinar verib onu azad etsinlər

Şöbi deyir: Elə ki, səhər açıldı, öz-özümə dedim: Yaxşıdır ki, şeyx Səidin yanına gedim və Quranın mənalarını ondan öyrənim. Onun sorağına getdim və onu məsciddə tapdım. Səid həmin dinarları yanında bölmüş və fəqirlərə sədəqə verirdi. Məni görcək ".buyurdu: "Bunlar hamısı Həsən və Hüseyn (əleyhissalam)-ın bərəkətidnəndir

Əgər bir barədə kədərləniriksə min dəfə şad oluruq. (Və hamısından artıq isə) Allah və .Rəsulu razı olurlar

## YETMİŞ ÜÇÜNCÜ HEKAYƏT.GEYİM, YEMƏK VƏ S.DƏ HƏYAT QAYDASI VƏ YOLU

Əli (əleyhissalam)-ın Əla ibni Ziyad adlı dostlarından biri Bəsrədə yaşayırdı. Bir gün o, . bərk xəstələndi. Əmirəl-möminin (əleyhissalam) onun əyadətinə getdi

Elə ki, Həzrət Əli onun geniş və böyük evini gördü buyurdu: "Dünyada bu genişlikdə evi "!?nəyə görə istəyirsən? Hansı ki, ona axirətdə daha çox ehtiyacın var

Sonra buyurdu: Bəli məgər ki, istəyirsən bunun vasitəsilə axirətə çatasan (onu özün :üçün mənəviyyat körpüsü qərar verəsən) belə ki

Bu evdə qonaqlar qəbul edəsən-١

Qohumluq tellərini bərkidəsən-٢

Vacib hüququnu (zəkat kimi) bu evdən çıxarıb əhlinə çatdırasan, bu surətdə belə-۳ ".evin olmaqla yanaşı axirətə də nail olmusan

Əli (əleyhissalam) buyurdu: "Onu mənim yanıma gətir." Elə ki, Asim Əli (əleyhissalam)- :ın hüzuruna gəldi Həzrət üzüünü ona tutub buyurdu

!Ey öz canının kiçik düşməni"

Şeytan sənə yol tapıb səni tovlamışdır. Ailənə niyə rəhm etmirsən?! Fikir edirsən ki, "?sənə gözəl və yaxşı həyatı halal edən Allah ondan faydalanmağını istəmir

".Sən bu işinə görə Allah hüzurunda qiymətsizsən"

!Asim ərz etdi: "Ey Əmirəl-Möminin

Axı sən də bu cür paltar, həmçinin quru və yararsız yeməklə yaşayırsan." (və mən də .(səndən dərs alıram

.İmam buyurdu: Mən sənin kimi deyiləm

Allah təala ədalət və haqq rəhbərlərinə özləri üçün çətinlik yaratmasını habelə öz" yaşayışlarını xalqın zəif və məhrum təbəqəsinin, eləcə də həyatı ilə eyni tərzdə etməsini yoxsulluq və kasıblıq fəqiri qıcıqlandırmasın deyə vacib etmişdi. Yoxsulu ".yoxsulluq üzündən Allaha itaət etməməli və fəqirlərə çətin keçməməlidir

:Bu minvalla İmam Əli (əleyhissalam) bu hərəkəti ilə biz bir neçə dərs öyrətdi

Xəstələrə baş çəkmək ٢-Yaşayışda təfrit və ifrata varmamalı ٣-Dünyanı axirət üçün -١ .körpü qərar vermək ٤-Haqq rəhbərlərinin sadə yolu seçmək vəzifələri

Asim İmamın sözün eşitdikdən sonra onu qəbul edib çiynindəki dəyərsiz əbanı kənara .qoydu və yeni bir əba geydi

Yeri gəlmişkən bu rəvayətə də diqqət yetirilməsi münasib olardı. Cəmad ibni Osman deyir: İmam Sadiq (əleyhissalam)-ın hüzurunda idim ki, bir kişi o Həzrətə ərz etdi: "Siz buyurdunuz ki, Əli ibni Əbi talib (əleyhissalam) qalın paltar və dörd dirhəmlik köynək ".geyirdi. Amma sizin əyninizdə isə təzə paltar görürəm

:İmam Sadiq (əleyhissalam) ona buyurdu

Əli ibni Əbi Talib (əleyhissalam) o paltarları elə bir zamanda geyirdi ki, pis görünüşlü" ".deyildi lakin əgər o paltarı indi geysəydi pislikdə barmaqla göstərilərdi

Deməli, hər zamanın ən yaxşı paltarı həmin dövrün paltarıdır. Lakin biz Əhli beytin

ardıcılları qiyam etməyə qalxdıqları vaxt Əli (əleyhissalam) kimi rəftar edərlər. (yəni hakim rəhbərlər gərək paltar ev və yeməklərini yoxsul təbəqənin həyatı ilə həmahəng .(etsinlər

## YETMİŞ DÖRDÜNCÜ HEKAYƏT.ÜZBƏÜZ TƏRİF

İmam Əli (əleyhissalam) Siffeyndə idi. Bir gün İslam döyüşçüləri Həzrətin ətrafına yığışdılar. İmam çıxışında Allaha həmd və sənadan sonra İslam başçılarının hüququ .barədə onun yolu ilə gedənlərə qiymətli və mühüm bir bəyanla söhbət etdi

Bu vaxt Həzrətin əshabından biri ayağa qalxıb Həzrəti tərif etməyə başladı. Bu tərifində Əli (əleyhissalam)-ın məqamından və İmamın fərmanlarından itaət və onun .yolu ilə gedəcəyini elan etdi

Nəql edirlər ki, bu şəxsi o günə qədər Əli (əleyhissalam)-ın ordusunda görməmiş--١ dilər. Həmin kəs Allaha həmd və səna etdikən sonra İmam Əli (əleyhissalam)-ı belə alqışladı: “Sən bizim rəhbərimiz və biz də sənin rəiyyətinik. Allah təala sənin vasitənlə bizi zillətdən izzət yoluna doğru və sair bəndələri də köləlik boyunduruğu altından nicat verdi. Biz sənin ixtiyarında və fərmanın altındayıq. Düz danışan, natiq və müvəffəq hakim, eləcə də fərasətli malik sənsən. Heç rəva deyil ki, sənə itaət olunmasın. Biz ”.sənin elm və kamalını heç kəsin elmi ilə müqayisə etmirik

Sənin əzəmət və cəlalın bizim yanımızda çox böyükdür və sənin fəzilətlərin bizim .yanımızda təsəvvür etdiyimizdən daha yüksəkdir

Amma bu şəxsin kim olması aydın deyildi. Əllamə Məclisi bu barədə belə deyir: “Belə məlum olur ki, bu kəs Həzrət Xızr (əleyhissalam) imiş ki, aşkar olub İmam Əli ”.(əleyhissalam) öz haqqında danışıbdır. Bundan ötəri ki, xalqa höccət tamam olsun

İmam Əli (əleyhissalam) haqqında deyilən tərifləri qəbul etmədi, çünki (Həzrətin məqamı bu sözlərdən daha yüksək və ehtiramlı idi. Buna görə də buyurdu: Allahın cəlalı hər kəsin yanında əzəmətli və böyük olarsa bütün şeylər onun nəzərində Allahdan kiçik olmalıdır... Daha sonra buyurdu: “Salehlərin qarşısında rəhbərlərin ən pis vəziyyəti onların fəxr və ziynətlərə aldanması, eləcə də yüksəliş axtarmaq cilvəsi ”.gümanıdır

Mən istəmirəm ki, bu mövzu sizin zehninizə yol tapsın. Belə ki, guya mən tərif və“ sitayişi sevir və onu eşitməkdən ləzzət aparıram. And olsun Allaha ki, mən belə deyiləm. Əgər sevmli olsaydım belə yenə böyük və sübhan Allahın bərabərində həqirlik və kiçiklik izhar etmək xatirinə ki, hamıdan çox tərif və sənaya layiqdir onun (tərifin) :tərk edilməsini seçərdim və axırda buyurdu

Həqiqətən də mən, və siz yeganə Allahın bəndələriyik Allah o qədər bizə malikdir ki,“ özümüz-özümüzə o dərəcədə malik deyilik. Allah bizi əvvəlki yolumuzdan xaric edib

nicat yoluna qaytardı. Qara qəlblik və kor zehinlikdən sonra bizə bəsirət və tanıma ”.yolunu göstərdi

.Beləliklə görürük ki, İmam Əli (əleyhissalam) üz-üzə tərif etməkdən nəhy edib

Xomeyni (müddə zillluhul ali) yadıma düşdü ki: Çərşənbə axşamı ۱۳۶۶-cı şəmsi ilinin mehr ayının ۷-də ölkənin bütün İmam cüməleri Ayətullah Meşkini ilə birlikdə Cəmaran Hüseyniyyəsində İmamın hüzuruna yetişdiilər. Ayətullah Meşkini İmam Xomeyninin çıxışından öncə bir neçə dəqiqə qabaq söhbət edərək o böyük şəxsiyyətin yüksək məqamına işarə etdi. İmam Xomeyni söhbətinin əvvəlində buyurdu “Mən əvvəlcə Ağayi Meşkinidən gilayə edirəm, ona görə ki, bizim öz nəfsimizə mübtəla olmağımız kifayətdir. Odur ki, daha başqa məsələləri buyurmayasınız ki, nəfslərimizdə üst-üstə ”...yığılıb bizi geri qaytarsın. Dua edin ki, insan olaq

səh:۸۱

Rəvayətlərdə gəlib: Həvarilər İsa (əleyhissalam)-ın xüsusi əshabları Həzrəti İsa :(əleyhissalam)-dan soruşdular

"?Ən xalis əməl nədir"

:O Həzrət buyurdu

Ən xalis əməl o əməldir ki, yalnız və yalnız Allah üçün yerinə yetirilsin və onu görən" ".kəs başqasının bu əməlinə görə onu alqışlamasını arzulamasın

## YETMİŞ BEŞİNCİ HEKAYƏT.ƏLİ (ƏLEYHİSSALAM) TƏLHƏNİN CƏNAZƏSİ YANINDA

Təlhə Übeydullahın oğlu Məkkə əhlindən və Qüreyş sülaləsindən idi. O, şücaətli və .səxavətli bir şəxs idi ki, onu Təlhətül-Cavad deyə çağırırdılar

O, İslama ilk qədəm qoyanlardan Ühüd və Xəndək, eləcə də zəmanənin digər müharibələrində iştirak edənlərdən biri idi. Osmanın xilafəti zamanında Təlhə Osmanla bərk müxalif və Osmanın qatillərindən biri idi. Əli (əleyhissalam) bir gün Təlhəyə buyurub israr etdi ki, "Osmanı azad edin." O, cavabında dedi: "Bəni-Üməyyəni ".cəzalan-dırmayınca Osmanın azadlığı mümkün deyildir

Təəccüblü burasıdır ki, həmin Təlhə Əli (əleyhissalam)-ın əleyhinə olan Cəməl müharibəsində, həmin ordunun Bəsrədəki bayraqdarı idi. Onun bayrağı altında yaşayan Mərvan adlı bir şəxs nəhayət Təlhəni öldürdükdən sonra dedi: "Osmanın ".qanının intiqamını Təlhədən aldım

Cəməl müharibəsinin ən böyük qızışdırıcılarından biri olan Təlhə nəhayət öldürüldü. Müharibədən sonra İmam Əli (əleyhissalam) cəsədlərin arasında gəzirdi. Elə ki, gözü Kə"b ibni Səid ibni Miqdad və s... kimilərin napak cəsədlərinə sataşdı bir neçə qısa sözlər buyurdu: Amma Həzrətin gözü Təlhənin napak cəsədinə sataşdıqda buyurdu: "Bu şəxs mənim beyətimi sındıran, fitnə və qalmaqal yaradan idi, həmçinin ümmət ".üçün camaatı məni və mənim nəslimi öldürməyə dəvət edirdi

Sonra İmam buyurdu: Onu əyləşdirin oradakılar onu oturtdular., Bu zaman İmam üzünü ona tutub buyurdu: "Ey Təlhə! Allahımın mənə verdiyi və"dənin haqq olduğunu

tapdım və sən də öz növbəndə Allahın günahkarların cəzası haqqında verdiyi ".və"dəsinə yetişdin. Daha sonra buyurdu: Cəsədini tullayın

Nəhcül-Bəlağə"də gəlmişdir İmam Əli (əleyhissalam) Təlhə və Əbdür-Rəhman ibni" İtabın cəsədlərinin yanından keçdikdə buyurdu: Əbu Məhəmməd (Təlhə) bu məkanda yalqız və həmdəmsiz qalıbdır. And olsun Allaha ki, mən səma altında qalmış Qüreyşlilərin cəsədlərinə baxmaq istəmirdim. Mən öz intiqamımı Əbd Mənaf övlaından aldım, amma Bəni Cümə

qəbiləsinin rəisləri qaçdılar, müharibə qızışdıranlar elə bir işə (yəni xilafət və rəhbərliyə) can atırdılar ki, buna əsla ləyaqətləri yox idi. "Hələ Arzularına çatmamış onların dartılmış boyunları sındırıldı." Beləliklə İmam Əli (əleyhissalam) öz qatillərinin .intiqamını aldı və fasidləri məhv etdi

## YETMİŞ ALTINCI HEKAYƏT.ƏQİLİN QIZMIŞ DƏMİRDƏN NALƏSİ

Həzrət Əli (əleyhissalam)-ın anası Fatimə Əsəd qızının Talib, Əqil, Cəfər və Əli (əleyhissalam) adlı dörd oğlu var idi ki, hər birinin digəri ilə aralarındakı fərqdə on il fasilə var idi. Əbu Talibin ikinci oğlu Əqil gözəl fikirli, hazır cavab və şücaətli idi. Siffeyn müharibəsində Əli (əleyhissalam)-ın döyüşçülərindən hesab olunurdu. Əqilin övladları və nəvələri xüsusilə də oğlu Həzrət Müslüm hamılıqla dinin himayətçilərindən idilər. Onlardan bir neçəsi də Kərbəlada İmam Hüseyn (əleyhissalam)-ın hüzurunda :şəhadətə yetişdilər. İmam Əli (əleyhissalam) xütbələrin biridə buyurur

And olsun Allaha ki, qardaşım Əqilin yoxsulluq və kasıblıq caynağı altında çapaldığını" gördüm. Məndən sizin hüququnuzdan olan buğdanın bir miqdarını ona bağışlamağını ".istədi

Elə bir halda ki, onun uşaqlarını yoxsulluğun şiddətindən pərişan və rənglərini solmuş gördüm. Elə bil ki, uşaqların üzləri ilə qaraldılmışdı. Əqil bir neçə dəfə Həzrətin yanına gedib qayıtdı. Hər dəfə də ürək yandırıcı halətlə öz istədiyini təkrar edirdi. Mən də onun sözlərinə qulaq asırdım. O belə güman etdi ki, mən dinimi satıb onun istəyinə itaət edir və öz iş tərzimdən əl götürərəm. Bu halda bir dəmiri qızdırıb Əqilin bədəninə yaxınlaşdırdım. Bu vaxt Əqil nalə çəkdi və az qaldı ki, qızmış dəmirin hərarətindən :yansın. Ona dedim

Anan yasında otursun, ey Əqil! İnsanın oyuncaq üçün qızdırdığı oddan nalə edirsən, amma məni elə bir oda tərəf sürükləyirsən ki, Cəbbar olan Allah onu Öz qəzəbindən alışdırıbdır. "Sən qısa müddətli dünya əziyyətindən nalə etdiyin halda mən cəhənnə-"?min alışdırılmış əbədi odundan nalə çək-məyim

Bura qədər sözü Əli (əleyhissalam)-ın dilindən eşitdik. İndi də Əqilin öz dilindən eşidək. Məşhur sünni alimi ibni Əbil Hədid deyir: Bir gün Müaviyə Əqildən soruşdu: "Qızdırılmış

”!?dəmir əhvalatı nədir

Əqil dedi: “Ruzigar mənim üçün çox çətin keçirdi. Yoxsulluq və əli boşluqdan təngə gəlmişdim. Qardaşımın yanına getdim nə qədər təkidlə kömək etməsini xahiş etdimsə də müsbət cavab eşitmədim. Nəhayət bütün uşaqlarımı götürüb Əli (əleyhissalam)-ın evinə getməkdən başqa bir çarə görmədim. Yoxsulluq və pərişanlıq uşaqlarımın ”.üzündən aşkar olurdu. Həzrət bunu görcək buyurdu: “Gecə gəl sənə bir şey verim

Gecənin qaranlığında uşaqlarımdan biri mənim əlimdən tutub Əli (əleyhissalam)-ın evinə apardı. Əli (əleyhissalam) oğluma çölə çıxmasını tapşırdı otaq xəlvət olduqdan sonra qardaşım dedi: “İndi götür” Məndə qızıl gümanı ilə sür”ətlə irəli getdim. Qəflətən ”.əlim qızmış bir dəmirə toxundu və onu əlimdən atıb nalə etdim

Həzrət buyurdu: “Anan yasında otursun, bu insanın dünya odu ilə qızdırılmş bir ?dəmirinin istiliyidir. Bəs, sabah qiyamətdə mənim və sənin halın necə olacaqdır

:Sonra bu ayəni (“Mömin” surəsi, ٧١) tilavət etdi

”.O zaman ki, zəncirlər onların boyunlarına asılar və onları çəkər“

:Sonra buyurdu

Beytül-malda Allahın sənə təyin etdiyi haqdan başqa məndə sənin haqqın yoxdur, get ”.evinə

Müaviyə təəccüb edib dedi: “Əfsus, əfsus, haradadır elə bir ana ki, Əli (əleyhissalam) ”?kimi bir oğul dünyaya gətirsin

## ... YETMİŞ YEDDİNCİ HEKAYƏT.HƏDİYYƏ FORMALI RÜŞVƏT YA

YETMİŞ YEDDİNCİ HEKAYƏT.HƏDİYYƏ FORMALI RÜŞVƏT YA İLANIN AĞZININ SUYU İLƏ QARIŞDIRILMIŞ HALVA

Əş”əs ibni Qeys (münafiqlrin başçısı) ən alçaq və hiyləgər, eləcə də Əli (əleyhissalam)-ın ən kinli düşmənlərindən biri idi. O, həmçinin Siffeyn müharibəsində və Həkəmeyn əhvalatında Əli (əleyhissalam)-a ən böyük xəyanətlərdən birini etdi. Nəhrəvan müharibə-sinin əsl qızışdırıcısı da elə o oldu. İbni Əbil Hədidin dediyinə görə Əli (əleyhissalam)-ın xilafəti dövründə baş vermiş hər hansı bir fitnə və fəsadlar Əş”əsin tərəfindən olmuş. O elə bir kəs idi ki, Kufədə evinin damında minarə tikdir-mişdi və namaz vaxtlarında azan verilən yerə qalxıb uca səslə Əli (əleyhissalam) xitab edib ”.deyirdi: “Ey Əli, (əleyhissalam) sən yalançı və sehrbazsan

İmam Sadiq (əleyhissalam) buyurdu: Əş”əs Əli (əleyhissalam)-ın qətlində, qızı Co”də İmam Həsən (əleyhissalam)-ın qətlində və oğlu Məhəmməd Əş”əs İmam Hüseyn

.(əleyhissalam)-ın qətlində iştirak etdi

İndi də hadisənin əslinə qayıdaq: Əş”əs ibni Qeys özünün xam xəyalı ilə Əli (əleyhis-salam)-a hədiyyə adlı rüşvət gətirməklə o Həzrətin hökumətinə yaxınlaşmasını, əticədə özünün maddi və mənəvi hədəflərinə çatmasını istəyirdi. Buna görə də halva hazırlayıb gecə vaxtı Əli (əleyhissalam)-ın evinə gəldi və qapını döydü. Əli (əleyhissalam) qapını açdı və Əş”əs halvanı Həzrətə təqdim etdi. İmam Əli (əleyhissalam) bu barədə buyurur: O halvaya elə bir şey qatmışdı ki, mən onu .bəyənmirdim, sanki o halva ilan ağzının suyu ilə qatılmışdı

Dedim: Bəxşişdir, zəkatdır, yoxsa sədəqə? Zəkat (vacib) və sədəqə ki, (müstəhəbb) .bizim ailə və sülaləmizə haramdır

.Əş”əs dedi: Nə zəkatdır, nə də sədəqə və hədiyyədir

Dedim: Yasçılar sənin yasında otursunlar, Allahın dini yolu ilə daxil olubsan ki, məni ?aldadasan? Sənin əqlinin nizamı pozulub dəli olmusan yaxud sayıqlayırsan

And olsun Allaha, əgər göylərin altında olan yeddi iqlimi mənə bağışlayalar, bundan ötəri ki, qarışqanın ağzından apardığı arpa qabığını ondan alacağım qədəri günah edəm, etməyəcəyəm. Həqiqətən də sizin dünyanız mənim yanımda çəyirtgənin ağzında çeynədiyi yarpaq qədər dəyrsizdir. Əlinin fani dünya nemətləri həmçinin onun müvəqqəti ləzzəti ilə nə işi? Allaha əql zəifliyindən və azğınlığından pənah aparır və .ondan kömək istəyirəm

Bu tərtiblə Əli (əleyhissalam) Əş”əsin rüşvət formalı hədiyyəsini rədd etdi və Əş”əsin .bu işi o Həzrəti icra etməkdən saxlaya bilmədi

## YETMİŞ SƏKKİZİNCİ HEKAYƏT.VƏFALI VƏ CƏSUR YOLDAŞIN MƏDHİ

Malik Əştər Əli (əleyhissalam)-ın səmimi, pak və şücaətli dostlarından idi. Elə bir dost :ki, Əli (əleyhissalam) bəzi vaxtlar öz yoldaşlarına buyururdu

Kaş sizin aranızda iki nəfər Malik Əştər kimi adamım olaydı." mən Peyğəmbər" səlləllahu əleyhi və alihi və səlləm üçün necə idimsə Malik də mənim üçün o cür idi. İmam Əli (əleyhissalam) öz danışıqlarının birində bu qəhrəman və cəsurun haqqında :belə buyurur

Allah ona xeyr versin ki, əyrilikləri düzəltdi və xəstələri müalicə etməyə başladı, sünnəti ayağa qaldırdı, fitnəni arxada qoyub imtahanlardan qəbul olundu və təmiz geyim az eyb ilə bu dünya ilə vidalaşıb əbədi həyata qovuşdu. Həmçinin, həyatın pisliyindən azad oldu. O Allah qarşısında öz məs"uliyyətini layiqincə yerinə yetirdi, .Allaha günah etməkdən çəkindi

O getdi lakin camaatı bir neçə yol ayrıcında qoydu və onlar da onun olması üzündən .sərgərdanlıq bataqlığında batdılar

Malik Əştər Əli (əleyhissalam) tərəfindən Misirin valisi təyin edilmişdi, Misirə sarı getdiyi zaman Müaviyənin məxfi muzduru tərəfindən zəhərli bal ilə şəhadətə çatdı. Bu :böyük insanın şəhadət xəbəri Əli (əleyhissalam)-a çatdıqda o Həzrət buyurdu

Malik?! Malik kim idi? And ola Allaha, əgər dağ idisə yeganə və yüksək bir dağ idi. Əgər" daş idisə elə möhkəm və hündür idi ki, heç kəs onun ətəyinə çatmazdı və heç bir ".yüksəyə uçan quş belə onun göylərə ucalmış zirvəsində qanad çala bilməzdi

## YETMİŞ DOQQUZUNCU HEKAYƏT.BEYTÜL–MALIN BÖLGÜSÜNDƏ BƏRABƏRLİK

Abdullah ibni Əsvəd Əli (əleyhissalam)-ın şiələrindən və silahdaşlarından idi. Baxmayaraq ki, atası və əmisi Bədr müharibə-sində şirk ordusunun tərəfdarı idilər və elə o müharibədə öldürüldülər. Babası Əsvəd Peyğəmbəri istehza edənlərdən biri idi, lakin özü Əli (əleyhissalam)-ın xəttində hərəkət edən və onun yolunu qəbul edənlərdən sayılır-dı. Bir gün o beytül-maldan öz

haqqından artıq istəyib xəyal etdi ki, Əli (əleyhissalam)-a yaxın olması xatirinə o Həzrət onu başqalarından üstün tutar, amma İmam onun istəyinin cavabında :buyurdu

Bu sərvət nə mənim, nə də sənidir. Əksinə müharibə qənimətlərindəndir ki,“ müsəlmanlar onu öz qılıncları ilə ələ gətiriblər. Əgər sən onlarla yoldaş olsaydın, onlar ”.qədər payın var idi, yoxsa onların ələ gətirdikləri özgəsinin ağzına yem olmayacaqdı

:Yuxarıdakı mövzunu nəzərdə tutmaqla aşağıdakı dastana diqqət edin

Asim ibni Kuləyb atasından nəql edib dedi: Əli (əleyhissalam)-ın hüzurunda idim ki, İranın bir hissəsindən beytül-mal ünvanıyla bir qədər pul və başqa şeylər gətirmişdilər. Həzrət ayağa qalxıb onu bölmək qərarına gəldi. Camaat öz paylarını almaq üçün hücum etdilər. Həzrət qayda-qanuna riayət etmək üçün göstəriş verdi ki, Hail ünvanıyla malların ətrafına bir ip çəksinlər və camaat ipin o biri tərəfində dayansınlar Əli (əleyhissalam) özü də ipin içərisinə daxil oldu və əmr etdi ki, Yeddi qəbilənin rəisləri (o gün Kufədə sakin idilər) hazır olsunlar. Həzrət hər qəbilənin payını onların nümayəndələrinə verdi ki, hər nümayəndə o malları öz qəbilələrinin üzvləri arasında bərabər surətdə bölsünlər. İşin sonunda boşalmış qabların içərisində bir parça çörək .qaldı

Əli (əleyhissalam) buyurdu: “Həmin çörəyi yeddi hissəyə bölün və hər hissəsini bir ”.qəbilənin payına əlavə edin

Başqa bir rəvayətə görə İmam Əli (əleyhissalam) müsəlmanların malını böldükdən :sonra onun yerini süpürüb su səpirdi, sonra ağ və sarı pullara işarə ilə buyurdu

”.Ey ağ və qırmızı (yəni qızıl və gümüş) pullar, məndən başqasını aldadın“

:Nəhcül-bəlağə”də ۲۳۲-ci xütbəyə nəzər salaq“

Bir gün Əli (əleyhissalam)-ın yanına iki qadın gəldi. Onlardan biri ərəb, digəri isə azad olmuş kəniz idi. İmam bir neçə dirhəm və bir miqdar yeməyi eyni bərabərdə onlara verdi. Bunu görcək ərəb qadın etiraz etdi və dedi: Mən ərəbəm, bu qadın isə əcəmdəndir. Niyə mənə artıq vermədin? İmam (əleyhis-salam) buyurdu: “And olsun

Allaha! Mən beytül-malın bölügüsündə İsmailin övladlarını İshaqın övladlarından üstün (görmürəm."(١

Əllamə Məclisi yazır: "İmam Əli (əleyhissalam) İslam məntəqələrindən, xüsusilə Şamdan başqa bütün maddi dünyanı buraxmışdı. O bu məntəqələrdən yığılan beytül-:malı bölüşdürdükdən sonra aşağıdakı şeri oxuyurdu

,Bu mənim əl səliqəmdir və ən yaxşısı ortasındadır"

".çünki hər bir canlının əli ağzına çatır



---

Biharul-ənvar" cild ٤١, səh.١٣٧"[٢٢] -١

## SƏKSƏNİNCİ HEKAYƏT.DİL–DAXİLİ QÜVVƏNİN NÜMAYƏNDƏSİ

Co"dət ibni Hubəyrə Məxzuni Əli (əleyhis-salam)-ın bacısı oğlu, onun da anası Ümmü Hani idi. İmam Əli (əleyhissalam) hadisə-lərdən birində ondan məsciddə camaat qarşı-sında çıxış etməsini istədi. O, minbərə qalxdı, amma danışa bilmədi və sakit :dayandıqdan sonra aşağı endi. Bu zaman İmam minbərə çıxıb edib buyurdu

Agah olun, dil insan bədəninin ətindən olan bir parçadır. Əgər bir insanın hazırlığı" olmazsa, dili söz deməyə qadir deyildir və əgər hazırlığı olub azad olsa nitq ona möhlət verməz (ürəyi istəyəcək ki, söz danışsın). Biz söz hakimləriyik və onun damar və ".kökləri bizdə möhkəmlənibdir

Beləliklə İmam (əleyhissalam) demək istəyir ki, dil insan ürəyinin və batininin nümayəndəsidir. Əgər insan düzgün çıxış etmək istəsə, gərək əvvəlcə canını və ruhunu elm, mərifət və əməl ilə qüvvətləndirsin. Digər tərəfdən isə hazırlıqdan sonra .gərək dilini qorusun çünki, dilin öz başına buraxılması böyük bir xətadır

Sonra Həzrət nübüvvət sülaləsinin söz danışmaqda qüvvətli olmalarına və onların vücudlarının dərinliklərində kök atmasına, eləcə də onun bu ailəyə məxsus olmasına .işarə etdi

## SƏKSƏN BİRİNCİ HEKAYƏT.ƏLİ (Ə) PEYĞƏMBƏR (S) AYRILDIĞI ÜÇÜN QƏMGİNDİR

SƏKSƏN BİRİNCİ HEKAYƏT.ƏLİ (ƏLEYHİSSALAM) PEYĞƏMBƏR SƏLLƏLLAHU ƏLEYHİ VƏ ALİHİ VƏ SƏLLƏMDƏN AYRILDIĞI ÜÇÜN QƏMGİNDİR

İmam Əli (əleyhissalam)-ın xüsusiyyət-lərindən biri də budur ki, Peyğəmbərin vəfatı vaxtı onun yatağının kənarında idi və o Həzrətin başı Əli (əleyhissalam)-ın sinəsi üstündə olduğu halda müqəddəs ruhu behiştə doğru yüksəldi. Əli (əleyhissalam) Peyğəmbəri kəfənə tutdu və ona namaz qılıb torpağa tapşırdı. İmam Əli (əleyhissalam) Peyğəmbərin müqəddəs cənazəsinə qüsl verdiyi zaman bir söz buyurdu ki, onun dözülməz qəmindən və mütəəssir olmasından xəbər verirdi. Həzrət :orada can yandırıcı bir mətləbə işarə edib buyurdu

Ey Allahın elçisi! Atam və anam sənə qurban olsun, doğrudan da ilahi hökmlər və“ .göylərin xəbərləri sənin getməyinlə kəsildi

Sən yeganə əziz idin və sənin vəfatın, qəmin o qədər böyükdür ki, başqa müsibətlərə baş sağlığı verir. Sən elə bir şəxssən ki, bütün camaat sənin matəmində qəmgin və ”.kədərlidirlər

Ey Allahın Rəsulu! Əgər sən bizə səbri əmr etməsəydin, eləcə də bizi nalə və“ dözümsüzlükdən uzaqlaşdırmasaydın sənin matəmində göz yaşlarımızın bulağı quruyana kimi ağlardıq, doğrusu, əhəmiyyətsiz şeylərdir, amma həmişəlik can yandırıcı qəm və kədərlə nə etmək olar? Ölüm inkar edilməz və çarəsiz bir ”.?həqiqətdir

Atam və anam sənə fəda olsun, bizi pərvərigarının yanında yada sal və öz xatirində“ ”.saxla

Başqa bir yerdə isə belə buyurur: “Səbr və hövsələ yaxşıdır, amma nə sənin nə də ki, sənin ayrılığına səbrim var. Sənin ayrılığının müsibəti çox ağırdır (və) səndən qabaq və səndən sonra hər müsibət kiçikdir” Əmirəl-möminin Əli (əleyhissalam)ın bu ibarə və danışıqlarından məlum olur ki, o Həzrət heç kəsin ayrılığında Allah elçisi səlləllahu əleyhi və alihi və səlləmin ayrılığı qədər kədərli olmamışdır. Hətta Əli (əleyhissalam) :Həzrəti Zəhra (s.ə)-ın müqəddəs bədənini dəfn edərkən Peyğəmbərə xitab edib deyir

Sənin vəfat faciənlə qarşılaşdıqdan sonra mənə hər haqqa bir müsibət yetişsə (yenə“ ”.də) kiçikdir

.Bu sözlərlə Əli (əleyhissalam)ın Peyğəmbərə nə qədər bağlı olduğunu dərk edirik

## SƏKSƏN İKİNCİ HEKAYƏT.OSMANIN ƏLİ (Ə)-A SİFARİŞİ VƏ HƏZRƏTİN CAVABI

.Osmanın öz xilafəti zamanı İslam qayda-qanunları ilə uyğun gəlməyən işlər gördü

Buna görə də onlar yığılıb onu öz evində mühasirə etdilər və hətta bir neçə gün ona su da vermədilər. Axırda onu elə öz evindəcə öldürdülər. Mühasirədə olduğu vaxt Osman Abdullah ibni Abbas vasitəsilə Əli (əleyhissalam)-a sifariş göndərdi və o Həzrətdən

Mədinədən xaric olmağını istədi ki, özünün Əli (əleyhissalam)-ın düzəltdiyi əkin yerlərindən birinə getsin, daha camaat Əli (əleyhissalam)-ın adına xilafət şüarı verməsinlər. İbni Abbas Osmanın sifarişini Əli (əleyhissalam)-a çatdırdı, İmam Əli (əleyhissalam) ibni Abbasa belə buyurdu:

Ey Abbasın oğlu! Osman istəyir ki, məni su daşıyan dəvəyə çevirsin və həmişə dəvə“ kimi o tərəf bu tərəfə gedəm. Bundan qabaq mənim üçün sifariş göndərdi ki, Mədinədən çıxım və sonra xəbər göndərdi ki, qayıdım. İndi də səni səfir edibdir ki, .Mədinədən çıxım

”.And olsun Allaha, o qədər onu müdafiə etdim ki, qorxdum məbada günahkar olam

Bu minvalla görürük ki, İmam Əli (əleyhis-salam) İslamı və İslami birliyi qoruyub saxlamaq üçün ciddiliklə çalışır və istəmirdi ki, İslam üçün xoşa gəlməyən bir hadisə baş versin. Buna baxmayaraq sonralar o Həzrətin müxalifətləri Osmanın köynəyini onun əleyhinə bayraq edib onu Osmanın qatili adlandırdılar və Osmanın intiqamını .almaq adı altında o Həzrətlə müharibəyə başla-dılar

## MƏKTUBLAR BÖLÜMÜ

### SƏKSƏN DİNARLIQ EV–۸۴

Şürəyh ibni Haris məşhur İslami şəxsiyyətlərdəndir. O, altmış il Kufənin qazisi olmuşdu. O, ilk dəfə Ömər ibni Xəttabın xilafəti zamanında qazi oldu ki, bu vaxt Şürəyhin təqribən qırx yaşı var idi. O, Osmanın xilafəti zamanı, eləcə də Əli (əleyhissalam)-ın .icazəsinə əsasən öz qaziliyində qalırdı

Baxmayaraq ki, Əli (əleyhissalam) bəzi nəzəriyyələrdə onunla müxalif idi və hətta bir neçə dəfə onu Kufədən öz kəndinə (Kufənin yaxınlığındakı) ki, sakinlərinin əksəri yəhudi idilər, sürgün də etdi, amma onu qazilikdən çıxarmadı. Bəziləri onun ömrünü .۱۸۳-il bəziləri də ۱۲۰-ilə qədər qeyd etimşdirlər

Şürəyh zehinli, ayıq və zirək bir şəxs idi. Onun qazilik və işləri islah etmək sahəsində qəribə səriştəsi var idi. Onun xüsusiyyətlərindən biri də saqqalının olmaması idi. Ərəblər arasında atalar sözü idi ki, deyirdilər: “Şüreyh tülküdən də zirək və ”.hiyləgərdir

Bu sözün ona deyilməsinin səbəbi bundan ibarət idi ki, Şürəyh bir müddət Nəcəf-Əşrəfdə yaşayırdı və o vaxt ibadət və namaza məşğul olduğu zaman bir tülkü gəlib .onun kənarında və qarşısında oynayır, beləliklə onun fikirini namazdan yayındırırdı

Bu hadisə bir müddət təkrarlandı. Nəhayət Şürəyh adama oxşar bir heykəli düzəldib öz papağını onun başına qoydu. Ondan sonra tülkü gəlir o heykəlin kənarında oynayırdı. Bir gün Şürəyh yavaşca o tülkünün arxasından gəlib onu tutdu və camaat da ".bu səbəbdən dedilər: "Şürəyh tülküdən də hiyləgərdir

Hər halda İmam Sadiq (əleyhissalam)-dan nəql edilmişdir ki, Həzrət buyurdu: Əli (əleyhissalam) Şürəyhi qaziliyə təyin etdikdə onunla şərt bağladı ki, Həzrət Əli .(əleyhissalam) təsdiq etmədən heç bir qərar çıxarmasın

İndi isə qayıdaq "Nəhcül-bəlağə"də Şürəyhlə bağlı dastana. Şürəyh Əli (əleyhissalam)-ın xilafəti zamanı özü üçün ٨٠ dinarlı bir ev aldı. Bu xəbər Əli (əleyhissalam)-a çatdırıldıqda İmam onu çağırıb buyurdu: Mənə məlumat verilib ki, sən ٨٠ dinar qiymətinə ev alıb onu öz adına qəbalə etdikdən sonra hələ ona şahid də tutmusan?! Şürəyh cavabında dedi: "Düzgün məlumat veriblər." İmam ona qəzəbli bir tərzdə nəzər salıb buyurdu: "Ey Şürəyh! Tezliklə bir kəs (Əzrail) sənin tərəfinə gələr ki, nə qəbzinə baxar, nə də şahid və şühudlarının imzasına diqqət yetirər, və səni ondan çıxarıb yalqız qəbir ".çuxuruna qoyar

Ey Şürəyh! Olmaya başqalarının malından alıb pulunu da (qiymətini) haram yolla ələ gətirmiş olasan? Əgər belədirsə öz dünya və axirətini əldən vermisən. Bunu bil ki, əgər evi olarkən mənim yanıma gəlmiş olsaydın, sənə elə bir qəbz yazardım ki, ona əməl etməklə hətta bir dirhəmə belə meyl göstərməzdin. Yazacağım qəbzin nüsxəsi belə idi: Zəlil bu evi dünya ilə xudahafizləşməkdə olan bir şəxs edən alıbdır ki, fani olanların :məhəlləsində və ölənlərin küçəsində yerləşir

Bu mülk bir tərəfdən bəla və müsibətlərlə zəngin, digər tərəfdən isə üzü müsibətlərə doğru irəliləməkdədir, üçüncü tərəfdən nəfsani həvəslərlə başqa bir tərəfdən isə .şeytanın hiyləsi ilə tamamlanır

Bu evi arzulara aldanmış və qısa bir müddətdən sonra dünyadan köçəcək izzətdən xaric məbləğə, qənaətə və dünya zillətinə daxil olmaq üçün alıbdır. Əgər bu evdə hər cür ixtilaf və fəsad baş verərsə İran Roma və Yəmən şahlarının çürümüş cəsədlərinin öhdəsinədir. Bu müddəanın şahidi həvayi-nəfsin tabeçiliyindən çıxan, dünyapərəstlik .zəncirlərindən azad olan əqlin etdiyi hökmdür

## ÖZ MEHVƏRİ ƏTRAFINDA QULDURLUQ EDƏNƏ ƏLİ (Ə)–IN KƏSKİN SİFARİŞİ–۸۴

Əli (əleyhissalam)–ın xilafətinin birinci ili idi. Əş”əs ibni Qeys ki, Osman tərəfindən Azərbaycanın valisi idi öz məqamında qaldı İmam Əli (əleyhissalam) öz ətrafındakı quldurluqdan xəbərdar idi. Buna görə də katibi Übeydullah ibni Əbi Rafiə Əş”əsə aşağıdakı məktubu yazmasını əmr etdi. O ۳۶–cı ilin Şəban ayında məktubu yazdı və o məktub Ziyad ibni Mərhəb Həmədaninin vasitəsilə Əş”əsə çatdırıldı. Orada deyilirdi:

Hakimlik məqamı sənin su və çörəyin üçün körpüyə çevrilməsin. Bəlkə bu məqam bir“ əmanətdir ki, sənin boynundadır, gərək özündən yüksək olan məqama itaət edəsən! Sənin haqqın yoxdur ki, millətə qarşı rə'y istebdadı ilə rəftar edəsən. Beytül-mal da gərək layiqli yerdə tam ehtiyatla sərf edilsin. Gərək Allahın mallarını mənə tərəf ”.göndərəsən. Ümid edirəm ki, mən sənə pis rəis olmaram

Bu məktubun bir hisəsi idi. Məktubu bütövlükdə oxumaq istəyənlər Ayətullah Xoyinin “Nəhcül-bəlağə”-nin şərhi kitabının ١٧-ci cildinin ١٨١-ci səhifəsinə müraciət edə bilərlər. Bu kitabda gəlmişdir: Elə ki, məktub Əş”əsə çatdı ayağa qalxıb camaat arasında çıxış :edib dedi

Ey Camaat! Əmirəl-Möminin Osman məni Azərbaycanın hakimi təyin etdi və özü“ dünyadan getdi. İndi camaat Əli (əleyhis-salam)-la beyət ediblər. Biz Əli (əleyhis-.salam)-ın da ardınca Osmanın ardınca getdiyimiz kimi gedəcəyik

Əş”əs mənzilinə qayıtdıqdan sonra öz yaxın əshablarını çağırıb onlara dedi: Əli (əleyhissalam)-ın məktubu məni dəhşətə salıbdır. O, Azərbaycanın mallarını tələb edir. :Bilin ki, mən (tezliklə) Müaviyəyə qovuşaram.” Əshab narahat olub dedilər

Ölüm sənin üçün bu qərara gəlməkdən daha yaxşıdır. Nədən ötrü öz şəhər və !?qəbilənin camaatını buraxıb özünü Şam camaatının günah bataqlığında batırırsan

Əş'əs bu sözləri eşitdikdən sonra özünə gəlib qərarını həyata keçirməkdən həya etdi. .Buna görə də Kfəyə gəlib Əli (əleyhissalam)-la görüşdü və özünü Həzrətə təslim etdi

## ƏLİ (Ə)–IN MÜAVİYƏ İLƏ OLAN MACƏRASI–٨۵

Nəhcül bəlağə”-nin məktublar bölməsində təqribən on üç uzun məktub gəlibdir ki,“ bunlar Əli (əleyhissalam) tərəfindən Müaviyəyə göndərilmişdi. Bu məktubların çox hissəsi müharibə, beytül-mal və başqa siyasi əhəmiyyətli məsələlərə aiddir. Elə buna görə də dastan xarakteri daşımadıqlarına görə onların hamısını qeyd etmir, yalnız bir :neçə nümunə ilə kifayətlənirik

Ruzigarın mənim kimi İslama xidmət etməmiş və keçmiş kimi keçmişi olmayan bir-١ adama həmtay etməsindən təəccüb edirəm və güman etmirəm ki, bu kəs belə bir

.iddia (İslamda qabaq olmaq barədə) etsin

Ey Müaviyə! Bizdən Şamı sənin ixtiyarına qoymağımızı istəmişdin. Amma bil ki, dünən“ sənə qadağan etdiyim bir şeyi bu gün sənin ixtiyarında qoymaram. And olsun Allha və canıma, ey Müaviyə! Bilirsən ki, mən Osmanın qanı barədə sizin hamınızdan təmizəm və bilirsən ki, mən (o vaxtlar) kənarda idim. Bir halda ki, hər cür cinayət etməyi qərara almısan mənim qorxum yoxdur.” Özünü şeytanın faydalanması üçün vasitə qərar vermə və şeytanın öz vücuduna nüfuz etməsi yollarını kəs. “Ey Müaviyə! Əməllərin barədə Allahdan qorx və cilovunu şeytanın əlindən al ki, dünyanın uçurumunda ”.durmusan və axirət sənə yaxınlaşıbdır

Sübhanəllah! Nə qədər qondarma həvəslərə bağlanmısan?! O da xalqın hüququnu tapdamaq və möhkəm dəlillərə etinasız yanaşmağınla. “Ey Müaviyə! Dünyapərəstlər .dünyasından hərislik qapısı üzünə açılmış olsun

Sən özün Quran əhli olmadığın halda bizi Quranın hökmlərinə dəvət etdin; buna görə də sənə müsbət cavab vermədik, əksinə, Qurana müsbət cavab verib və onun fərmanını icra etdik. Ey Müaviyə! Bil ki, sənin, babanın, qardaşının və dayının (Ühüd müharibəsində) başlarına enən qılınc indi də mənim yanımdadır. And olsun Allaha, bilirəm ki, sən axmaq və kor qəlblisən və sənin haqqında layiqdir ki, belə deyilsin: Elə ”.bir nərdivanla yuxarı qalxmısan ki, səni təhlükəli uçuruma doğru aparır

Allah bəndəsi Əmirəl-mömininindən Əbu Süfyan oğlu Müaviyəyə! Mən Höccəti sizə“ tamam etdiyim üçün sizdən bizarlıq axtardım. Yaxşı bilirsən ki, olmalı işlər qarşıya çıxdı və bu sərgüzəştin uzun başı vardır. Keçmişdən keç. İndi sənin vəzifən Şamda olan camaatdan mənim tərəfimdən beyət almaq daha sonra bir dəstə silahdaşlarınla ”.mənim tərəfimə tələsib təslim olmaqdır

## QƏTİ SİFARİŞ–۸۶

Curəyr ibni Abdullah Bəcəli Əli (əleyhis-salam)-ın yaxşı və şücaətli yoldaşlarından idi ki, hələ əvvəllər Osman tərəfindən hakim təyin edilmişdi. Həzrət Əli (əleyhissalam) öz xilafəti vaxtı onu yerində saxladı və o camaatdan Əli (əleyhissalam) rəhbərliyi üçün beyət aldı. Curəyr bundan əlavə İmam Əli (əleyhis-salam)-a belə bir təklif etdi: “Şam camaatının əksəriyyətinin mənim qəbiləmdən olmalarını nəzərə alaraq məni Şama ”.ezam et ki, onlardan sənin üçün beyət alım

İmam bu təklifi qəbul edib onu Şama göndərdi. Curəyr Şama daxil olduqdan sonra çıxış etdi və camaatı Əli (əleyhissalam)-ın rəhbərliyini qəbul etməyə dəvət etdi. Amma .Müaviyə bu işdən hələ də vaz keçir, vaxt tələf edir və möhlət istəyirdi

Curəyr hadisəni olduğu kimi (əleyhissalam)-a çatdırdı. İmam Əli (əleyhissalam) :Curəyrin cavabında belə yazdı

Məktubum sənə çatdıqdan sonra Müaviyəni qəti hökmə təklif et ki, öz rə”yini söyləsin“ və (əgər gördün baş dolandırır) onu müharibə ilə təslim olmaq arasında azad qoy.

Əgər müharibəni seçdi onunla müharibə elan et və əgər təslim oldu ondan beyət al, vəssəlam.”

Nəhayət Curəyr Müaviyədən məyus olub Kufəyə sarı qayıtdı.

## MALİK ƏŞTƏR–SƏRKƏRDƏLƏRİN SƏRKƏRDƏSİ–٨٧

İmam Əli (əleyhissalam) bir qoşunu iki nəfərin Ziyad ibni Nəzr, və Şürəyh ibni Haninin sərkərdəliyi altında Müaviyə ordusu ilə vuruşmaqdan ötrü cəbhəyə yollayaraq onlara İslam ordusunun qorunması və düşmənin xəbərsiz olması haqda müxtəlif üsullar .öyrətdi

.Sonra Malik Əştəri onların ardınca göndərib əvvəldəki iki sərkərdəyə belə sifariş etdi

Malik İbni Haris Əştəri sizin və onla-rın əmiri etdim, onun əmr və göstərişlərinə qulaq asıb icra edin. Onu özünüzün zireh və qalxanınız edin. O elə bir şəxsdir ki, güman .etmirəm süstlük göstərib büdrəsin

İmam Əli (əleyhissalam) başqa bir məsələdə Misir camaatına olan sifarişində Malik :Əştərin şə"nində belə deyir

Allahın bəndələrindən (Malik Əştər) birini sizə sarı göndərdim ki, müharibənin qorxulu vaxtı onu yuxu tutmur, düşməndən qorxmur və cinayətkarlara qarşı odun şöləsindən .də yandırıcıdır. O, Malik ibni Haris qəbiləsindəndir. Sözünü eşidib fərmanını itaət edin

Çünki, Malik Əştər Allah qılıncla-rından biridir. Elə bir qılınc ki, itilikdən kütlüyə qayıtmır" və zərbəsi təsirsiz olmur. Əgər o müharibə üçün hərəkət əmri verərsə hərəkət edin, yox əgər dayanmaq əmri verərsə dayanın. Onun gördüyü hər bir iş mənim gördüyüm .işdir

Mən belə bir şəxsiyyəti yollamaqda sizləri seçdim. Bundan ötrü ki, sizlərəi nəsihət edib ".yolu və çarəni sizə göstərsin, eləcə də düşmənlərinizə qarşı kəskin və barışmaz olsun

Budur Malik Əştərin Əli (əleyhissalam)-ın yanındakı parlaq siması Doğrudan da təəccüblüdür. Görəsən İmamlardan başqa elə bir şəxs tanıyırsınız ki, Məsum İmam bu ...?qədər ona arxayın olmuş ola

## İBNİ ABBASA ŞİDDƏTLİ XƏBƏRDARLIQ–٨٨

Əli (əleyhissalam)-ın əshabı arasında Abdullah ibni Abbas fiqh və İslam elmləri həmçinin tədbir baxımından nümuəvi bir kəs idi. Cəməl müharibəsindən sonra Bəsrə,

coğrafi-mövqeyi cəhətindən həssas mərkəzlərdən biri idi. Digər tərəfdən də arada böyük müharibənin baş verməsi və adamları hər iki tərəfin qalmış qohum .əqrəbalarının orada sakin olmaları Bəsrəni qorxulu və kol altında olan oda bənzədirdi

.Buna görə də bu şəhərin ayıq və tədbirli bir hakimə ehtiyacı var idi

İmam Əli (əleyhissalam) bu xüsusiyyətləri nəzərə almaqla Abdullah ibni Abbası (öz əmisi oğlu) Bəsrənin hakimi təyin etdi və bir müddətdən sonra bu "xəbərdar edici" .təşkilatı ona göndərdi

Ey Abbasın oğlu! Bil ki, Bəsrə (indi) şeytan məkanı və fitnə toxumu səpilmiş bir yerdir. Buna görə də diqqət et ki, Bəsrə camaatı ilə rəftarın ehsan və məhəbbət əsasında olsun. Onları onlarda olan hökumət qorxusundan çıxar ki, əmniyyət və sakitlik hiss etsinlər. Mənə Bəni-Təmim qəbiləsi ilə pis rəftar etməyin xəbəri çatıbdır. Bil ki bu qəbilə qədim zamanlardan bəri igid kişilər sahibi olmuşdur. Əgər onlardan biri gedərsə digəri onun yerini tutur. Onların cahiliyyət və İslam dövründəki döyüş məharəti və qəhrəmanlıqlarını, həmçinin bizimlə olan qohumluqlarını nəzərə al. Əgər biz onlarla açıq və kin küdurətlə rəftar etsək. sileyi-rəhim etmək əqrabalıq rabitəsi rəvayətini .tapdalamış olar və nəticədə Allah bizdən haqq-hesab istər

Ey Abbasın oğlu! Müdara et! Çalış ki, mənim sənə qarşı olan gümanım davam etsin və .sənin barəndə olan fikirim dəyişməsin

### HAKİMİN KİTAB ƏHLİNƏ YANAŞMA RƏFTARI–۸۹

.Əli (əleyhissalam)-ın xilafəti zamanı fars və Bəhreyn camaatı (çoxu) atəşpərəst idilər

İmam Əli (əleyhissalam) Ömər ibni Əbi Sələməni həmin məntəqənin hakimi təyin etdi. Hakimin həmin yerdə yaşayan müşriklərlə olan rəftarı düzgün deyildi, belə ki, o onların .təhqir edir və onlara kobud rəftarla yanaşırdı

O məntqənin əkinçiləri Əli (əleyhissalam)-ın yanına gəlib öz hakimlərindən ona şikayət etdilər. İmam Əli (əleyhissalam) Ömər ibni Sələmə üçün bir məktub yolladı. O məktubda belə yazılmışdı: “Sənin əmrin altında olan əkinçilər dözülməz təhqir və onlara qarşı daşürək olmağından şikayət etmişlər. Onlar bizim razılığımıza əsasən İslam hökumətinin pənahında yaşayırlar. Buna görə də onlarla yumşaqlıqla rəftar et ”.və onlara mülayim siyasət yolu seçməklə yanaş

### BEYTÜL–MALI TALAYANLARA CİDDİ XƏBƏRDARLIQ–۹۰

Cəməl müharibəsindən sonra İmam Əli (əleyhissalam) Abdullah ibni Abbası Bəsrənin valisi təyin etdi. O Ziyad ibni Əbihi Bəsrədəki canişini təyin edib Əhvaz və fars tərəfinə yollandı. Əli (əleyhissalam)-ın qasidləri o Həzrətə Ziyad ibni Əbiyhin beytül-mala və xalqın mallarına xəyanət etməsini, həmçinin özü üçün ondan artıq istifadə etməsini :xəbər verdilər. İmam ciddi, təkan verici bir məktubla ona belə yazdı

Allaha and içirəm ki, əgər müsəlmanların beytül-malına az ya çox xəyanət etməyin“ xəbəri mənə çatarsa və İslam qanunları əleyhinə onları bağışlamış olarsansa, işini yoxsul olana kimi çətinləşdirərəm. O, qədər çətinləşdirərəm ki, qoy arxan cərimə yükü ”.altında əyilsin və zəlil olasan

## ŞƏHADƏT YATAĞINDA MEHRAB ŞƏHİDİNDƏN BİR NEÇƏ SÖZ–٩١

İbni Mülcəm o daş ürəkli və özünü müqəddəs kimi göstərən qatil ٤٠-cı hicri ilində ramazan ayının ١٩-da səhər vaxtı məsciddə namaz qılarkən Əli (əleyhissalam)-ın başına zərbət endirdi. Əli (əleyhissalam)-ın yarılmış başından axan qan məscidin .mehrabını Həzrətin al qanına qərq etdi. İmamı mənzilə apardılar

.Əli (əleyhissalam) şəhadət səfəri və dost görüşünə sakin olmuşdu

Yatağının ətrafını tutmuş qohum və əshabı qəhramanlar qəhramanın simasını öz qanına boyandığını görürdülər. Həzrət ruzigarın vəfasızlığından qəmgin nəzərə çarpırdı. Hamı ondan sonuncu öyüd və nəsihəti gözləyirdilər. O iki gül yarpağı tək olan dodaqlarını açıb dedi: “Heç bir vaxt Allaha şərik və tay tutmayın və heç vaxt Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin sünnətini korlamayın. Bu iki sütunu (tövhid və sünnəti) möhkəm qoruyun və bu iki çırağı işıqlı saxlayın. Dediklərimi ”.gördükdən sonra heç bir məzəmmətdən çəkinməyin

İmam bir neçə dəqiqə sükut edib bir daha buyurdu: “Mən dünən sizin kənarınızda idim və bu gün vücudum sizin üçün ibrət və nəsihətə səbəb olmuşdur və sabah sizdən ayrılıram... Həyatda işiniz hədiyyə və güzəşt etmək olsun. Məgər Allahın sizi bağışlamasını istəmirsiniz? And olsun Allaha heç bir ölüm nişanəsi mənə tərəf üz tutmayıbdır ki, mən onu bəyənməyəm və o işin başlanğıcı aşkar olmayıb ki, mən onu .pis biləm

Mənim ölümə olan eşqim gecə vaxtı su axtaran və qəflətən həmçinin itgisini tapmış“ adamın sevincinə bənzəyir və Allahın yanında olan bütün şeylər yaxşılar üçün ”.üstündür

Bəli, ilk mehrab şəhidinin söylədiyi bu son sözlər dostun arxasını möhkəmləndirir, .düşmənin isə belini sındırır

## DÜŞMƏNİN PLANINI POZAN FƏRMAN–٩٢

Quşəm ibni Abbas Əmirəl-möminin Əli (əleyhissalam)-ın əmisi oğlu və Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin yaxın əshablarından hesab olunurdu və o Həzrətə

oxşayırdı. İmam Əli (əleyhissalam) ölkənin idarə işlərini əlinə aldıqdan sonra onu Məkkə şəhərinin hakimi təyin etdi. O, Əli (əleyhissalam) şəhadətə çatana kimi Məkkənin hakimi oldu. Əli (əleyhissalam)-ın birinci dərəcəli düşməni Müaviyə gizlincə xəyanət planı hazırladı. Həmin plan həcc mövsümündə bir qrup adamın Şamdan Məkkəyə getməsi və orada şayiə yaymaq və yalan deməklə xalqı Əli (əleyhissalam)-ın əleyhinə qaldırmaq həmçinin xalq arasında Əli (əleyhissalam)-ı Osmanın qatili yaxud ondan himayə etməyən bir kəs kimi tanıtmaq, digər tərəfdən isə

Müaviyənin sün"i işıqlarını yaymaqdan ibarət idi. Əli (əleyhissalam)-ın Şamda gizli olan xəbər çatdıranları əhvalatı ona xəbər verdilər. İmam Əli (əleyhissalam) dayanmadan Quşəmə bir məktub yazıb onu baş verəcək hadisədən agah etdi. Həmin məktubda :belə gəlib

Mənim xəbər çatdıranlarım Şam camaatın-dan kor qəlbli və cildini dəyişib tanınmaz .olan bir qurpun Məkkəyə tərəf göndərilməsini məlumat vermişdirlər

Onların məqsədi həcc mövsümündə camaatın zehnini qaraltmaq və batili haqq kimi .qələmə verməkdən ibarətdir

Onlar dini dünyaya satanlar və axirət cəzalarından xəbərsiz olduqlarına görə olan yarışda olan imkanlardan aqilanə istifadə etməklə. (və Məkkənin ehtiramını nəzərə almaqla yanaşı) eyni zamanda ciddi və düşmən planını poza biləcək bir qiyam və .hərəkət et

Rifah və nemət vaxtı məğrur və xoşhal olan, narahatlıq və çətin vaxtda isə süst və zəlil .olanlardan olma hökmən işə ciddi başla, vəssəlam

## ƏMR AS İMAMIN MƏZƏMMƏT DALĞALARI ALTINDA–٩٣

Əmr As ibni Vailin oğlu və Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin besətinin əvvəllərində bir dəstə adamla onu ələ salan və o Həzrəti "Əbtər (sonsuz) adlandıranlardandır. Hiyləgər Əmr As dönük yola və günaha qərq idi. Müaviyə onu özünün xüsusi müşaviri təyin edib onun alçaq hiylələrindən Əli (əleyhissalam)-ın əleyhinə istifadə edirdi. O da dünyanın bər-bəzəyinə və Misir vilayətinin hakimiyyətinə nail olmaq üçün var qüvvəsi ilə Müaviyəyə kömək edir və başını onun astanasına .qoymuşdu

İmam Əli (əleyhissalam) həmişə belə hiyləgər və alçaq adamların bərabərində qəzəbli idi. Yeri gəlmişkən İmam Əli (əleyhissalam)-ın xəttində olanları tanımaq, eləcə də Əmr As kimi satılmış adamların qarşısında necə mövqe tutmaq lazım olduğunu bilmək üçün .Əli (əleyhissalam)-ın ona yazdığı məktubun tərcüməsini diqqətinizə çatdırıram

:Məktubun başlanğıcı belədir

Allah bəndəsi Əmirəl-Mömininindən cahiliy-yət dövründə Məhəmməd və Ali-Muhəmmədlə düşmən olan əbtər(۱)oğlu əbtər Əmr Asa Salam olsun. O, kəsə ki, Haqq yolu ilə gedir. Doğrusu sən öz kişiliyini kənara, dilini isə onunla oturub duranlardan axmaq olan fasiq və abırsız bir kəsin yolunda qoymusan. O, din və əmanəti səndən oğurlayıb dünya və axirətini bada verdi. Amma bu yolda nicat yoxdur. Əgər haqqın ...tərəfdarı olsaydın arzuna çatardın



---

Əbtər–sonsuz, zatı qırıq[۲۳] -۱

:Nəhcül-bəlağə”də gəlmiş bu məktubun başqa bir hissəsində belə oxuyuruq“

Ey Əmr As! Sən öz dinini olan bir kəsin xəttində qoymusan. Abırlı adamların onunla“ oturub durması onların ətəyində ar ləkəsinə və onunla söhbət etmələri onların ağılsızlığına səbəb olar. Sən itin şir dalınca gedib onun qarətlərindən asılı olduğu kimi onun dalınca gedib hədiyyəsini istədin. Artıq ovlarına ümid bağlayıb dünya və axirətini korlamısan. Bir halda ki, əgər haqqa qovuşmasaydın istədiyinə yetişərdin, əgər sənə və Əbu Süfyanın oğlu Müaviyəyə əlim yetişərsə mütləq sizi fisq, günah və cinayətlərinizə görə cəzalandıracağam və əgər sizə əlim çatmazsa axirət dünyasında ”.Allahın ədalət məhkəməsində sizi daha şiddətli əzab gözləyir

## ÜSTÜN CƏHƏTLƏRƏ GÖRƏ VƏZİFƏYƏ TƏYİN ETMƏK–٩۴

Ömər ibni Əbi Sələmə Ümmü Sələmənin oğlu (Rəsulullahın) həyat yoldaşı idi Cəfəri Təyyarın atası o vaxt onunla Həbəşəyə mühacirət etdikdə dünyadan getdi və bu hadisədən sonra Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onun anası ilə evləndi. Bu adam Əli (əleyhissalam)-ın onu Bəhreyn və Farsın hakimi təyin etdiyi ləyaqətli bir şəxs idi. Digər tərəfdən də qüdrətli şair və Ənsarın söz ustadlarından sayılan No”man .ibni Əclan özünün gözəl şerləri ilə nübüvvət xanidanını himayə etməyə qalxdı

İmam Əli (əleyhissalam) üstünlük qanunla-rına riayət əsasında Ömər ibni Əbi Sələmə ni vəzifəsini layiqincə yerinə yetirəndən sonra geri çağıraraq No”man ibni Əclanı onun yerinə təyin etdi, çünki Siffeyn müharibəsi davam edirdi və Ömər ibni Əbi Sələmənin vücudu onun həm Qüreyşin böyüklərindən, həm də İslamda gözəl keçmişə malik olan şəxsiyyətlərindən sayıldığına görə orada daha çox lazım idi. İmam Ömər ibni :Sələməyə aşağıdakı məzmunda bir sifariş göndərdi

Mən No”man ibni Əclanı Bəhreynin valisi təyin edərək sənin ixtiyarını oranın“ valiliyindən geri çağırdı. Sən orada öz rəhbərliyini çox gözəl yerinə yetirərək əmanət haqqını düşzgün riayət etdin. Belə ki, heç bir sui-zənnə səbəb olmadın tez özünü mənə çatdır çünki qərara almışam Şam tələbkarlarına doğru hərəkət edəm. Mənimlə yoldaş olmağını çox istərdim. Çünki sən elə adamlardansan ki, həmişə düşmənlə döyüşdə və İslamın əsasını bərpa etməkdə bizlərə kömək etmisən və sən bu işlərə layiqsən. ”.İnşallah

## ƏLİ (Ə)–IN NƏZƏRİNDƏ BEYTÜL–MAL OĞRULARI–۹۵

Məsqələt ibni Hubəyrə Şəybani Məxcəd qəbiləsinin böyüklərindən, eləcə də Bəni Şəyban ailəsindən sayılırdı. O Həzrət Əli (əleyhissalam) tərəfindən fars məntəqələ-rinin biri olan Ərdəşir Xurrənin valisi təyin edilmişdi. Bu vilayətin İslam qüvvələri vasitəsilə İslamın bayrağı altına tabe olunmasını nəzərə alaraq qənimətlər və əldə edilən malların bütün müsəlmanlar arasında bölünməsi əmr edildi. Bu zaman Məsqələt saysız hesabsız hədiyyə və bəxşişləri öz yaxın adamlarına paylamaqla müsəlmanların beytül-malına xəyanət etdi. Bu xəbər İmam Əli (əleyhissalam)-a çatdırıldıqda İmam :Məsqələyə belə bir sifariş göndərdi

Sənin gördüyün işlər barədə mənə bir xəbər çatıbdır, əgər bu xəbər doğru olarsa sən“ öz Allahını qəzəbləndirmiş və öz İmamının fərmanından boyun qaçırmışsan. O da budur ki: Sən müsəlmanların can və qanları ilə ələ gətirdikləri qənimətləri öz qohumların və yaxın adamların arasında bölmüsən. And olsun o Allaha ki, insanı yaratdı. Əgər bu xəbər düz çıxsa, mənim yanımda puç və xar olacaqsan, yaradanının haqqını yüngül sayıb dinini dünyaya satma. Əgər belə olsa o, zaman ən ziyan verici .adamlardan sayılacaqsan

Agah ol müsəlmanların haqqı bu qənimətlərin bölünməsində həm sənin həm də“ mənim yanımda barabər və eynidir. Bütün o mallar mənim əlimə çatmalıdır ki, ”.müsəlmanlar öz paylarını məndən alsınlar

Beləliklə İmam Əli (əleyhissalam) beytül-malı yeyib talayanlarla qətiyyətli rəftar .edərək onları alçaq və puç adlandırırdı

## !?NİYƏ RƏNGLİ SÜFRƏ BAŞINDA ƏYLƏŞDİN–۹۶

Osman ibni Hunəyf Əsil, şəhamətli Ənsarın ən seçilmiş (Mədinə müsəlmanları) şəxsiyyətlərindən Ovs sülaləsindən idi ki, qardaşı Səhl ibni Hunəyf ilə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin hüzuruna gələrək İslamı qəbul etdilər və onlar İslam yolunda var səyi ilə çalışan müxlislərdən idilər və köhnə müsəlmanlardan hesab .olunurdular

Bu şəxs Peyğməbər səlləllahu əleyhi və alihi və səlləmin vəfatından sonra Həmişə Əli

(əleyhissalam) ilə bir olub enişli-yoxuşlu yollarda heç vaxt o Həzrətdən ayrılmamışdı. O ömrü boyu həqiqət yolundan heç vaxt çıxmadı. O Şortətul-Xuməys (Əli (əleyhissalam)-.ın ölümə hazır ordusundan) idi və ixlas və şəhamətlə bu yolda addım atırdı

Əli (əleyhissalam) xilafətə yetişdikdən və İslam hökuməti işlərini əlinə aldıqdan sonra Abdullah ibni Amir Osman ibni Əffanın xalası oğlu onun tərəfindən Bəsrənin valisi təyin olunmuşdu. Əli (əleyhissalam) onu valilikdən xaric edərək Osman ibni Hunəyfi onun .yerinə təyin etdi

Osman ibni Hunəyf Bəsrəyə tərəf gələrək cüz"i yanaşma və toqquşmadan sonra .Bəsrənin valiliyini öz əlinə aldı və bu diyarın camaatının işlərinə yetişməyə başladı

Osman Cəməl müharəbəsi başlanana kimi Bəsrənin valisi idi. Lakin Cəməl müharibəsi ərəfəsində onunla silahdaşları arasında bir tərəfdən digər tərəfdən, isə düşmənləri vasitəsilə toqquşma baş verdi. Osman ibni Hunəyf yaxşı müqavimət və şücaət göstərdi, ancaq axırda qüvvənin azlığı və təchizatın olmaması üzündən məğlub olub düşmənin əsirinə çevrildi və düşmən tərəfindən işkəncəyə məruz qaldı. Sonradan azad olundu və Ziy Qar məhəlləsində Əli (əleyhissalam)-a qovuşduqda İmam onun haqqında dua edib buyurdu: "Sən bu dönməzlik və yaxşı işlərinlə xeyir və mükafata ".nail oldun

Osman ibni Hunəyf Bəsrənin valisi olduğu müddətdə pis bir iş tutub ki, bu bir İslam :valisinin şə"nindən uzaq idi. Onun tutduğu iş bu idi

Bəsrə pullarından birinin nahar (ya şam) yeməyi dəvətini qəbul edərək onun əlvan" ".süfrəsinin kənarında əyləşdi ki, bütün dəvət olunanlar varlılardan ibarət idi

Bu işin haram olmamasına baxmayaraq onun kimi bir şəxsiyyətin elə bir mövqeiyyətdə olması düzgün deyildi. Bu hərəkət camaatı Əli (əleyhissalam)-ın hökumətinə qarşı bədbin edirdi. Bunu görən xalq elə fikirləşirdi ki, görəsən niyə Əli (əleyhissalam)-ın valisi xüsusi sinifdən olanlarla oturb-durur? Və çox güman ki, həmin ...əlaqə fürsət axtaranlar üçün körpü olardı və s

Əli (əleyhissalam)-ın qasidləri bu xəbəri Həzrətə çatdırdıqda İmam Əli (əleyhissalam) Osmana müfəssəl bir məktub yazdı ki, həmin məktub "Nəhcül-bəlağə"də ən dərin və :dəyərli məktublardan hesab olunur. Bu məktubun əvvəlində belə gəlib

Ey Hunəyfin oğlu! Mənə məlumat çatıb ki, Bəsrənin cavan ... və pullularından biri səni" evinə ziyafətə dəvət edibmiş ki, sən də (işin nəticəsini nəzərə almadan) bu dəvətə tərəf tələsmisən və orada sənin qabağına cürbəcür ləzzətli xörəklər düzüblər ki, onlar .sənin ağzına ləzzət gətirib

Mən güman etmirdim ki, sən elə adamların qonaqlığını qəbul edəsən ki, yoxsulları ac-

yalavac, o süfrədən uzaq, amma varlıları oraya dəvət olunmuş və o süfrənin başında əyləşmiş olalar. Bir bax gör ki, sən bu axurdan nə çeynəyirsən!? Bir müsəlman şəxsin halal malı olduğuna yəqinin olmadığın şeyləri kənara tulla və halal olduğuna yəqinin .olduqlarından istifadə et

Ey Osman ibni Hunəyf! Bil və dərk et ki, hər şəxsin bir rəhbəri vardır. Belə ki, müxtəlif məsələlərdə ondan dərs və ibrət alırlar. Belə ki, onu özləri üçün inam yeri və örnək sanaraq onun dünya görüşü və təcrübəsindən bəhrələnirlər. Elə isə bil ki, sizin rəhbəriniz Əli (əleyhissalam) öz dünyasından paltar sarıdan iki dəyərsiz paltarla kifayətlənib, dünya yeməyindən iki tikə arpa çörəyinə qənaət edibdir. Doğrudur ki, sizin bu həddə qədər qüdrətiniz yoxdur (mənim kimi olasınız) lakin, mənə nəfsi ".öldürmək, istiqamət və işlərdə diqqət məsələsində kömək etməlisiniz

:Bu məktubun digər bir hissəsində buyurur

Əgər bal şəhdindən (süzmə baldan) və buğdanın məğzindən yemək hazırlamaq və" bunları bir-birinə qarışdırıb yemək, eləcə də ipək paltar geymək istəsəm bunu edə bilərəm lakin heyhat, nəfs həvası mənə qalib gələ bilməz. Hərislik və

tamah məni vadar edə bilməz ki, belə yeməklər yeyim, lakin Hicaz və Yəmamədə elə bir adam olsun ki, bir tikə çörəyi tapa bilməsin və heç vaxt doyunca çörək yeməmiş olsun; Yaxud (bu olan iş deyildir ki,) mən tox qarınla yatam, amma ətrafımda ac :qarınlar və yanmış cigərlər yuxuya getməsinlər, ya şair demişkən

Həmin dərd sənə bəsdir ki, tox qarınla yatasan, ətrafındakı ac cigərlər isə bir kasa“ ”.xörək ələ gətirmək üçün (ya quru çörək) qanad çalsınlar

Görəsən bununla kifayətlənim ki, bu şəxsin möminlərin əmiri və rəisi olmasını desinlər amma möminlərin çətinliyində iştirak etməmiş olum ya həyat çətinliklərində onların ”!!?rəhbəri və qabaqcılı olmayım

Məktubun başqa bir qismətində isə buyurur: “Danışıqlarımızdan qulağıma belə çatdı ki, :deyir

Əbu Talibin oğlunun xörəyi belə (sadə) olarsa zəifliyə səbəb olur ki, bu zəiflik onu qəhramanlarla döyüşməkdən geri qoyar. Lakin bunu bil ki, dağlıq yerin ağacı daha möhkəm, yaşıl ağacların (ki onlara baxılır) qabıq-ları isə nazikdir. Digər tərəfdən isə çöl ”.atları çöplərinin şöləsi daha qızğın sönməsi isə daha keçicidir

Mənim Peyğəmbər səllƏllahu əleyhi və alihi və səlləmə olan bağlılığım işığın işığa nisbəti kimidir. And olsun Allaha, əgər bütün ərəblər birləşib mənim döyüşümə gəlsələr müharibəyə arxa çevirmərəm və əgər əlimə fürsət keçərsə tələsik (düşmənin başını əzmək üçün) gedərəm, ardıcıl səy edərəm ta yer üzünü bu yoldan döndərib iki üzlü .(Müaviyə kimi) adamın murdar vücudundan təmizləyim

:Həzrət məktubunun sonunda isə belə buyurur

Ey Osman! Allahdan qorx, bir neçə tikə çörəyə qənaət et, bəlkə cəhənnəm odundan“ ”.nicat tapasan

### !KUMEYLİN TƏNBİHİ-٩٧

İmam Əli (əleyhissalam)-ın yaxın və xüsusi şiələrindən olan Kumeyl ibni Ziyad Nəxəi .idi

Kumeyl duasını o, Həzrət Əli (əleyhissalam)-dan nəql etdiyinə görə də bu dua onun adı ilə bağlıdır. O, seçilmiş və ləyaqətli şəxslərdən idi ki, Əli (əleyhissalam) ona yüksək elmi və irfani mərhələni öyrətmişdi. Kumeyl Əli məktəbində inkişaf etmişdi ki, onu "Sahibi sirr" (ya Əli (əleyhissalam)-ın sirr saxlayanı) adlandırmışdılar. O, ibadətdə və gecəni yuxusuz keçirməkdə təqva və Allaha təzimdə İmamın əshabı arasında nümunəvi idi. İmam Əli (əleyhissalam) onun şəhadət xəbərini Kumeylə xəbər vermişdi. O doxsan yaşında (İraqın cəllad valisi Əbdül Məlik) in sərəncamı ilə Həccac ibni Yusif Səqəfi .tərəfindən şəhadətə yetişdi

Həzrət Əli (əleyhissalam) onu özünün xilafəti dövründə (İraqın yaşayış məntəqələrindən biri) Hiytə şəhərinə vali təyin etmişdi. Məşhur sünni alimi İbni Əbil Hədid yazır: O qətl və qarətlər ki, İraqın ətrafındakı yaşayış məntəqələrində Müaviyə ordusu tərəfindən olurdu, o zəiflik nəticəsində onların qarşısını almadı. Daha sonra onu əvəz etmək yerinə Qirbisaya (Müaviyənin ixtiyarında olan şəhərlərdən biri idi) və onun nahiyələrinə hücum etdi. Buna görə də Əli (əleyhissalam) tərəfindən tənbih olundu. (belə ki, aşağıdakı məktubda gəlibdir). Bu məktub Kumeylin hərbi və siyasi zəifliyini göstərən nişanədir. O məktub göstərir ki, layiqli və təqvalı şəxslər nə qədər zöhd sahibi olsalar belə təkcə bu kifayət deyildir. İslam nəzərində hər bir müsəlman bütün sahələrdə qüdrətli və cəsarətli olmalıdır. Məktubun əsli belədir: "İnsanın öhdəsində qoyulan hər bir işdə eləcə də ixtiyarında olan məntəqələrdə və işlərin yerinə yetirilməsində olan israrda süstlük onun acizliyini və batil rə"yini sübut edən və onu ölümə aparan aydın bir misaldır. (ey Kumeyl sən Qirqisa əhlinə hücum etdin lakin ixtiyarında olan məntəqələrin sərhədlərinin qorunmasına göz yumdun. Belə bir iş düzgün deyildir, həqiqətdə isə sən düşmənlər üçün bir körpü olmusan ki, öz dostlarının ".qətl və, qarətinə əl atmaq niyyətindədirlər

Nə bir qüdrətli biləngin var, nə, də düşmən qəlbində qorxu ya heybət yaratmağı" bacarırsan.? Nə bir sərhəddi qoruyursan nə düşmənin çiynini əzə bilirsən, nə diyarının şəhər və əhalisini qorumağa yetişmirsən, nə də öz rəhbərini oranın işlərinə dəxalət ".etməkdən azad qoyursan

### ƏBU MUSA VƏ YA AXMAQ MÜTƏKƏBBİR–٩٨

Abdullah ibni Qeys (Əbu Musa kimi tanınan) hicrətin yeddinci ilində İslamı qəbul etmiş və Peyğəmbər Əkrəm səlləllahu əleyhi və alihi və səlləmin yoldaşlarından hesab edilirdi. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onu Zübeyd Ədən və Yəmən sahillərinin hakimi təyin etmişdi. Ömər öz xilafəti zamanı onu Bəsrənin hakimi təyin etdi. Osman öz xilafət dövrü onu bir müddət Bəsrənin hakimiyyətində saxladıqdan sonra onu bu vəzifədən azad etdi. Əbu Musa Kufəyə gəldikdən sonra Kufə camaatı öz valiləri Səid ibni Asdan narazı olduqları üçün onun çıxarılması və Əbu Musanın Kufənin .hakimi olmasını tələb etdilər

Osman bu tələbi qəbul etdi. Əbu Musa o vaxtdan Cəməl müharibəsi başlananədək .Kufənin valisi idi

Osman öldürüləndən sonra İmam Əli (əleyhissalam) hakimiyyətə gələnədək Əbu Musa Kufədə camaatdan beyət almadı və bu barədə süstlük və sükut etdi. Elə ki, beyət sındıranlar (beyəti pozanlar) Cəməl müharibəsini qızışdırdılar. İmam Əli (əleyhissalam) öz ordusu ilə onları məğlub etmək üçün yola düşdü. (Kufənin hakimi) .Əbu Musa camaatı Bəsrə cəbhəsinə səfərbər etməli idi

Amma deyirdi: Əli (əleyhissalam) bir rəhbərdir ki, onunla olunan beyət düzdür, vəli onunla qiblə əhli əleyhinə müharibəyə qalxmaq düzgün deyildir. Bu minvalla nəinki camaata hərəkət vermədi, əksinə onları öz hərəkətlərindən də saxlardı. Bu xəbər Əli (əleyhissalam)-a çatdıqda Həzrət aşağıdakı məzmunda məktub yazdı ki, həmin :məktubdan bəzi nümunələri burada qeyd edirik

Allah bəndəsi Əli (əleyhissalam) Əmirəl-möminindən Abdullah ibni Qeysə (Əbu Musaya) Sən tərfdən mənə xəbər veriblər ki, həm xeyrinədir (bu cəhətdən ki, Əli (əleyhissalam) haqq bilirdi) həm də ziyanına (müharibəyə hərəkət verməkdən maneçilik törədirdi). Göndirdiyim qasidlə tezliklə himmət kəmərini bağalayıb, bayıra çıx və camaatı başına yığ. Əgər haqqı tanıyıb öz qərarını qəbul etdin camaatı Bəsrəyə .doğru hərəkatə səfərbər et, yox əgər süstük göstərsən öz məqamından uzaqlaş

And olsun Allha, hər kim olsan və hər yerdə olsan sənin tərəfinə gələcəklər və səni ətini sümüyünü və yaşını və qurunu bir-birinə qatanadək buraxmazlar (və bu müharibənin alovu səni də ətəyini tutacaqdır buna görə də səhlənkarlıq etmə və :haqqın yolunda çalışqan ol)... və axırda buyurdu

And olsun Allha ki, bu haqq yoludur və haqq tərəfdarlarının vasitəsilə icra olunur. (bu" surətdə) Allahdan xəbərsizlərin nə iş gördüklərindən qorxum yoxdur. O, Əli (əleyhissalam)-ın sifarişinə əhəmiyyət vermədi Əli (əleyhissalam)-ın ordusu Mədinədən Zi Qar (Bəsrənin yaxınlığında) yetişdikdə o Həzrət İmam Həsən və Yasir Əmmarı Kufəyə göndərdi. Bu iki böyük şəxsiyyət Kufəyə gəlib Kufə camaatını cihada dəvət etdilər və nəticədə yeddi min nəfər Kufədən hərəkət edib Əli (əleyhissalam)-ın ordusuna qoşuldular. Əbu Musa belə bir həssas şəraitdə səhlənkarlıq etdi. Elə ki, onun səhlənkardığının xəbəri Rəbəzə də (Mədinənin yaxınında) İmam Əli (əleyhissalam)-a :çatdı Həzrət ona bir məktub yazıb buyurdu

Ey Haikin oğlu! (Haik toxucu mənasındadır və burada da kinayə onun axmaqlığından və təkəbbüründəndir, yəni axmaq mütəkəbbir) Səni Kufənin hakimiyyətindnən uzaqlaşdırdım və bu vəziyyətin bizə qarşı birinci azar olmayacaqdır. (Həkəmeyn .(cərəyanına işarədir

### MƏKKƏ HAKİMİNİN ZƏVVARLAR PLANI-٩٩

Quşəm ibni Abbas Əli (əleyhissalam)-ın əmisi oğlu, ləyaqətli və əhdinə sadiq hesab olunurdu. O, İmam Əli (əleyhissalam) tərəfindən Məkkənin hakimi və valisi idi. İmam Əli (əleyhissalam) ona bir məktub yazaraq orada həcc mərasiminin yerinə yetirilməsi və zəvvarların Beytül-haramda necə ibadət etmələrinə dair göstəriş verib xatırlatdı ki, Allah qonaqlarına Məkkədə böyük hörmət etmək lazımdır İmam Əli (əleyhissalam)-ın

:gös-tərişləri aşağıdakı on maddədə xülasələşir

Xalq üçün həcc mərasimini bərpa edərək onun düzgün əməllərinin icrasında onlara-۱ ;yol göstər

;Allahın böyük günlərini onlara xatırla-daraq həmin günləri daima yaşat-۲

Səhər-axşam zəvvarların üzləşdiyi çətinlikləri yoxlayaraq onların aradan-۳ ;qaldırılmasında səy göstər. Bu işdə öz vaxtını əsirgəmə

;Hacıların suallarına diqqətlə qulaq asıb cavab ver-۴

səh:۱۰۳

;Qafilləri və bilməyənləri xəbərdar et-۵

Zəvvarların alimləri ilə iclas quraraq müsəlmanların ən ümdə məsələlərinin müzaki--۶ ;rəsi həllinə yol tap

;Özünlə onların arasında səfir ya vasitə qoyma. Əksinə özün onların arasında ol-۷

Səninlə görüşmək istəyənləri görüşdən məhrum etmə; Çünki, bu arzuda olanları elə-۸ .ilk dəfədən qapından qovsan, sonradan onların müşküllərinin həllində aciz qalacaqsan

Beytül-mal və ümum xalq malı barədə diqqətli ol; Belə ki, beytül-malı ac ailə-۹ sahibləri və yoxsulların arasında düzgün bölüb xərclədikdən sonra əlavəsini bizə .göndər ki, buradakı camaatın da ona ehtiyacı var

Məkkə əhlinə bu şəhərdə yaşayanlardan icarə haqqı almamalarını əmr et. Çünki-۱۰ :Allah (“Həcc“ surəsi, ۲۵-ci ayə) belə buyurur

”.Həm xaricdən gələnlər, həm də Məkkə sakinləri olanlar bu torpaqda bərabərdirlər“

Akif yaşayanlar badi isə Məkkəyə başqa yerlərdən həcc mərasimini icra etmək üçün .gələn zəvvarlardılar

”.Allah bu torpaqda siz və bizlərə yaxşı işlər görməyimizdə müvəffəqiyyət inayət etsin“

Doğrusu bu on maddəlik plana diqqət yetirməklə onun maddələrinin rifah, əmniyyət, .inkişaf və zəvvar mədəniyyəti xatirinə tərtib olunduğunun şahidi oluruq

## VALİNİN QƏLBİNİ ƏLƏ ALMAQ–۱۰۰

Səhl ibni Hunəyf İslamın ilk müxlis müsəlmanlarından və Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləmin ən yaxın silahdaşlarından biri sayılırdı. O bütün müharibələrdə o Həzrətin hüzurunda düşmənlə vuruşaraq Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən sonra Əli (əleyhissalam)-ın xəttində də hərəkət edirdi. Səhl İmam Əli (əleyhissalam) tərəfindən Fars əyalətlərinə vali və fərmandar təyin olunmuşdu. O, Eləcə də bir müddət Mədinənin fərmandarı vəzifəsində də çalışmışdı. Əli (əleyhis-salam) öz ordusu ilə Mədinədən Qasitlər və Nakəslərin müharibəsinə

.hərəkət etdiyi zaman Mədinədə öz canişini qoymuşdu

O ۳۸-ci Hicri ilində Siffeyn müharibəsindən sonra Kufədə dünyadan köçmüşdü. İmam Əli (əleyhissalam) onun ölümündən bərk narahat olmuşdu və Hunəyfin cənazəsinə beş dəfə namaz qılmışdı. (yəni hər dəfə yeni cəmiyyət gəldiyindən namazı təkrar qılmağa məcbur idi. Həzrət Əli (əleyhissalam) bu zaman buyurdu: "Əgər buna yetmiş "...dəfə belə namaz qılsam, yenə də layiqdir

.O ənsar başçılarından Osman ibni Hunəyfin qardaşı və Əvs sülaləsindən sayılırdı

Kufədə olan İmam Əli (əleyhissalam)a bir qrup adamın Mədinədən Şama gedərək Müaviyəyə qoşulması xəbəri çatdıqda Mədinənin fərmandarı olan Səhl bu vəziyyətdən çox narahat və mütəəssif oldu. Bu vaxt İmam Əli (əleyhissalam) Səhlə bir

məktub yazdı. Bu məktubu fərmandar ürəyini ələ almaq üçün yazılan bir namə kimi də adlandırmaq olar. Əli (əleyhissalam) bu məktubda belə yazmışdı. Mənə məlumat çatıb ki, o diyarın camaatından bəzisi gizlin halda Müaviyənin yanına qaçmışlar. Bu barədə heç də təəssüflənmə, habelə bir qrup öz hami və silahdaşlarından itirdikdə, əsla fikirləşmə. Onlar üçün yalnız bu kifayətdir ki, düz yoldan azğın yola düşüblər ki, bu da sənin sakitləşməyin üçün tutarlı bir əsasdır. Onlar dünya-pərəst olduqlarından dünyaya doğru sür"ətlə yüyürmüşlər, bir halda ki, ədaləti yaxşı başa düşüblər. Onlar bilirlər ki, bizim hökumətimizdə bütün camaat eyni hüquqa malikdir. Onlar bu .bərabərlikən öz mənafeləri naminə boyun qaçırmışlar

And olsun Allaha onlar ədalətə qovuşmamışlar. Biz ümidvarıq ki, Allah bu yolda" ".çətinlikləri bizim üçün həll edərək səhmansızlıqlara səhman verəcək

Bu minvalla Əli (əleyhissalam) öz fərmandarının qəlbini ələ alaraq, nəinki, bir qrup cəmiyyətin yoldan dönməsinin qarşısını almaqda zəiflik göstərmədi, hətta onu qəlbə təskinlik verən bir əsas saydı. Çünki onlar adi və təbii surətdə müqəddəs İslam cəmiyyətindən uzaqlaşmışdılar. Beləliklə onların bu uzaqlaşması nəticəsində cəmiyyət .onların murdar vücudundan təmizləndi

### XAİN İCRA HAKİMİNİN TƏNBEH OLUNMASI–١٠١

Münzir ibni Carude Əbdi böyük ərəb şəxsiyyətlərindən və Əbdül-Qeys qəbiləsindən sayılırdı. Atası (Carud) əvvəllər məsihi idi, ٩-cu hicri ilində bir dəstə adamla Mədinəyə gəlib İslamı qəbul etmiş, sonra isə Bəsrədə yaşayaraq kafirlərlə müharibədə İran torpağında şəhadətə yetişmişdi. Münzir Həzrət Əli (əleyhissalam) tərəfindən İslam ölkəsi nahiyələrindən birində icra hakimi təyin edilmişdi. Buna baxmayaraq o beytül-mala xəyanət edib saysız-hesabsız hədiyyə və bəxşişlərlə öz qohum qardaşına əl .tuturdu

Bu xəbər Əli (əleyhissalam)-a yetişdikdə İmam (əleyhissalam) bu sifarişi onun üçün .göndərərək onun həbs olunmasını əmr etdi

Atanın ləyaqətli olması, məni sənə qarşı xoşbin və qafil etdi. Belə güman edirdim ki, sən də atanın yolu ilə gedəcəksən (pərhizkarsan), lakin birdən mənə xəbər verdilər ki,

sən nəfsani həvəslərin dalınca düşüb öz axirətin üçün bir şey qoymamısan. Sən öz dünyanı abad etməklə axirətini viran qoyursan. Belə ki, öz qohumlarına qovuşmaq naminə öz dinini əldən veribsən. Əgər sənin barəndə mənə çatan xəbərlər düz olsa, qohumlarının dəvəsi və ayaqqabının bağı səndən yaxşıdır. Sənin kimi bir adam nə sərhəd qorumağa layiqdir, nə icra edilməsi işləri öz öhdəsinə götürməyə qüdrəti ola .bilər nə də öz hörmətini yuxarı aparmağa ləyaqəti olmaz

".Allahın istəyi ilə bu məktubum sənə çatdıqda durmadan yanıma gəl"

## ƏLİ (ƏLEYHİSSALAM)–IN RƏBBANİ ALİMƏ NƏSİHƏT–١٠٢

Abdullah ibni Abbas Abdül Mütəllibin oğlu həm Peyğəmbərin həm də Əli (əleyhissalam)-ın əmisi oğlu sayılırdı. Bəni-Haşim Şebe Əbu Talibdə mühasirədə olduqları vaxt (yəni besətin ٧ və ٨-ci ili) həmin Şebdə (Məkkədə) dünyaya gəlmiş .təqribən hicri ٧١-ci ilində ٧٥ yaşında Məkkədə də dünyadan köçmüşdü

O, Quran müfəssiri olub Əli (əleyhissalam)-ın ləyaqətli şagirdlərindən eləcə də İslamın böyük alimlərindən hesab olunurdu. Onun Peyğəmbər xanidanına böyük məhəbbəti var idi. O, dünyadan köçən zaman Məhəmməd ibni Hənəfiyyə (Əli (əleyhissalam)-ın :oğlu) deyirdi

".Bu gün bu ümmətin İlahi alimi dünyadan köçdü"

Ölüm yatağında olarkən bu sözləri tez-tez təkrar edirdi. İlahi! Diriyəm o, əqidəyə ki, Əli (əleyhissalam) onunla diri idi və ölürəm o əqidə ilə ki, o dünyadan getdi. Bu sözləri .söylədikdən sonra canını tapşırdı

Qeyd etmək lazımdır ki, Cəməl mühari-bəsindən sonra İmam Əli (əleyhissalam) Abdullah ibni Abbası Bəsrənin fərmandarı təyin etmişdi. Əllamə Xoyi özünün "Nəhcül-.bəlağə"dəki şərhində yazır

İslam genişləndikdən sonra vergi və bəzi İslami qənimətlər sel kimi Hicaza axmağa başladı. Əshablardan bəziləri mal toplayıb yığmağa hərisləşdilər. İmam Əli (əleyhis-salam) onlara nəsihət edərək bu işdən çəkinmələrini söylədi. Həzrət Əli (əleyhis-salam) bununla əlaqədar olaraq ibni Abbasa aşağıdakı məzmunda belə bir məktub :yazdı

Sən Allah tərəfindən təyin olunmuş əcələ toxuna bilməzsən (yəni qarşısını ala .bilməzsən). Sənin ruzin olmayan bir şey sənə qismət olmayacaq

Bil ki, dünya iki gündür. Bir günü sənin xeyrinə. İkinci günü isə sənin ziyanınadır. Bil ki, dünya dəyişilən və yenilik əmələ gətirən bir evə bənzəyir. Dünyadan sənin üçün təyin olunan şey sənin sorağına gələr, nə qədər aciz olsan belə o şey ki, sənin ziyanınadır gec-tez o da sənin yaxanı tutacaqdır nə qədər qüvvətli olsan belə. Daha başqa bir

:yerdə belə buyurur

Açıq üzlə camaatla davran və ədalətli mühakimə yürütməklə onlara bax. Qəzəb və (kindən uzaq ol, bil ki, kin şeytanın bir nümunəsidir.(۱

İmam bu nəsihətlə hətta böyük məzhəbi şəxslərə belə xəbərdarlıq etdi ki, məbada camaatı təhqir edib ümumi-mala əl uzadalar. Məbada dünyadan qafillik onların qürurunu artıra və məbada öz ətəklərini dünyaya bulaşdıralar. Dünyanı özlərinə hədəf .sanalar. Əksinə, dünyanı axirətə və ali mənəvi hədəflərə körpü edib istifadə etsinlər



---

.Müaviyənin tərəfdarları–nakisinlər beyəti pozanlar və müharibə qızışdıranlar[۲۴]-۱

Ötən dastanlarda Xəvaric macərasına (۲۸-ci dastan) xülasə şəkildə də olmuş olsa işarə etdik. Xəvaric Əli (əleyhissalam)-ın dünənki silahdaşları idilər ki, kor qəlblilik, tərslik və nadanlıq üzündən Həkəmiyyət məsələsi və Siffeyn müharibəsində Əli (əleyhissalam)-.a qarşı əks mövqe tutdular

Nəhayət onların hamısı (bir neçə nəfərdən başqa) şiddətli müharibədə (Nəhrəvan .müharibəsi) Əli (əleyhissalam)-ın ordusu tərəfindən qətlə yetirildilər

Bu müharibədən əvvəl İmam (əleyhissalam) müxtəlif yollarla onlarla əlaqəyə girməyə cəhd edirdi. Belə ki, bəlkə aralarındakı ixtilaf müzakirə və münazirə yolu ilə həll olsun ta iş müharibəyə çəkməsin. Lakin onlar Əli (əleyhissalam)-ın nəsihətlərinə qulaq asmayıb müharibə alovunu daha da qızışdırdılar. Yuxarıdaki qeyd olunan yollardan biri də bu idi ki, İmam əmisi oğlu ibni Abbası bir neçə dəfə özü ilə onlar arasında vasitə qərar vermişdi. Lakin əyri inam və yalançı hasarların məhbusuna çevrildiklərindən ibni Abbasla danışmazdan əvvəl cüz"i məsələlərin zikrinə başladılar. İbni Abbasa onların "...!?yanına müzakirəyə gəldikdə deyirdilər: "Bu gözəl paltarı niyə geymisən

:İmam İbni Abbasa buyurdu

Xəvariclə Quran ayələri vasitəsilə bəhs etmə, zira Quran bir kitabdır ki, onun ayə və" şərhlərini ehtimallarla mənalaşdırmaq olar. Məsələn mümkündür, sən bir şey deyəsən ki, cavabında onlar da başqa bir söz söyləsinlər və, bu da nəticəsiz qalacaq, lakin onlarla Peyğməbər səlləllahu əleyhi və alihi və səlləmin sünnəti ilə bəhs et ki, bunun ".müqabilində cavab tapmayacaqlar

İbni Abbas Əli (əleyhissalam)-ın fərasətli və sayıq şagirdi olduğuna görə Əli (əleyhissalam)-dan Həkəmiyyətin əsl düzlüyünü (onun keyfiyyətini nəzərə almaqla) onlara sübut etməkdən ötrü Quran ayəsi istəyirdi, nəticədə isə qısa fikirlilik və cahillik üzündən Quranın məna və anlayışlarını əsassız dəlil və ehtimallarla rədd edərək xəyal edirdilər ki, hər bir mövzu üçün xüsusi ayə olmalıdı. Deyirdilər ki, Quran "iki siyasi qurupun Həkəmiyyətin barədə bir söz demədiyindən müsəlmanların hər iki .qurupunun-Həkəmiyyəti batildir

:Mötəziləli alim ibni Əbil Hədid deyir

...Yuxarıdakı söz misilsizdir. Belə ki, bu sözün çox ali bir məfhumu vardır

Sonra deyir: Əgər ibin Abbasın hansı sünnətlə-Xəvariclə danışması sual olunarsa cavabında belə deyərik: İmamın məqsədi Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin açıq və dəlilə ehtiyacı olmayan sözləridir. Məsələn Peyğəmbərin aşağıdakı :buyurduğu cümlə kimi

Əli haqqla, haqq isə Əli (əleyhissalam)-dır. Harada haqq olsa Əli (əleyhissalam)-da“ ”.onunla harada Əli olsa şübhəsiz haqq da onunladır

Ya da Qədir hədisi kimi; Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm bu hədisdə :buyurmuşdu

İlahi! Əlini dost tutanları, sən də dost tut və onu özünə düşmən sananları sən də“ .düşmən bil. Əli (əleyhissalam)-a gömək edənlərə sən də kömək et

Buna oxşar rəvayətləri əshab Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən eşitdiyinə görə sössüz qəbul edirdi. Amma Xəvariclər isə hətta bu danışığın aşkarlıq və .qətiyyətindən belə boyun qaçırırdılar

Xəvaricin başqa hədəflər güdməsi get-getə Əliyə sübut olurdu. Həzrət bu barədə nə .qədər səy göstərərək hüccəti tamam etdisə də onlar öz tərsliklərindən əl çəkmədilər

.Nəticədə Əli (əleyhissalam) onlarla müharibə etməyə məcbur oldu

## QISA KƏLMƏLƏR BÖLÜMÜ

### İĞTİŞAŞLARDA İNSANIN VƏZİFƏSİ-١٠۴

.Dünyada baş verən fitnələr və hadisələr müxtəlifdir

Bir ixtilaf gah iki münhərif qrup arasında, gah, iki şəkkli, bəzən də iki haqq və batil qrup .arasında baş verir

İslam nəzərincə haqqı himayə edib batil ilə mübarizəyə qalxmaq lazımdır. İki qrp arasında, yəni batil və şəkkli qruplar arasında fitnə fəsadlar baş verərsə belə hallarda İslam dayanmaq əmri verir, əlbəttə dayanmaqdan məqsəd kənara çəkilib laqeyd qalmaqlıq deyildir. Əksinə, məqsəd budur ki, bir müsəlman insan yolunu azmış ya .şəkkli adam üçün körpü və arxa olmalıdır. Belə ki, ondan batil üçün istifadə etməsinlər

:İmam Əmirəlmöminin (əleyhissalam) buyurur

Fitnələrdə az yaşlı dəvəyə bənzə. Nə belini əy ki, sənə minsinlər və nə də döşün olsun“ .ki, səni sağsınlar. Yəni heç vəchlə batil yolla gedənləri müdafiə etmə

.Bu yandırıcı oddan ayıq və uzaq ol ki, iddiaçılar canını satın almasınlar

İmam Əli (əleyhissalam) camaatı o qədər azad buraxmışdı ki, onların istədikləri vaxtda Həzrətdən sual soruşmağa icazələri var idi. Həzrət bəzən onlara belə buyururdu: “Hələ ”.aranızdan getməmiş suallarınızı məndən xəbər alın

Bir gün bir şəxs o Həzrətin hüzuruna gəlib soruşdu: Məgər Peyğəmbər səlləllahu əleyhi ?və alihi və səlləm belə buyurmurdu

Saçlarınızın rəngini dəyişdirin və özünüzü yəhudiyə oxşatmayın?” (Saçlarınıza rəng və“ .(həna qoyun, nəinki yəhudi kimi rəngsiz və dağınıq olsun

İmam buyurdu: Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm bu sözü İslam ardıcıllarının çox az miqdarda olduqları zaman buyrumuşdu. Bu gün isə İslam genişlənib və əmin amanlıq hökm sürür. Hər kəs istəsə öz saçını rəngləyə də bilər, .rəngləməyə də bilər

Başqa bir gün bir şəxs o Həzrətdən soruşdu: “Xeyir (yaxşılıq) nədir?!” İmam cavabında buyurdu: Xeyir, səadət sərvət və uşaqlarının artmasında deyil, xeyir və səadət elm, helmin (səbirin) artımındadır. Eləcə də xeyir və səadət Allha pərəstiş xəttində addım atdığına görə etdiyin iftixardadır əgər yaxşı iş görsən Allha şükr et yox əgər pis iş gördün onun dərgahından bağışlanmağını dilə. Bu dünyada yalnız iki adam səadətə .yetişər

.Tövbəsi ilə keçmiş günahlarının bağışlanmasını istəyənlər–١

.Yaxşı iş görənlər–٢

Başqa bir şəxs o Həzrətə dedi: “Ya Əmirəl–möminin! Əgər saqqalına rəng və həna ”!qoysaydın nə yaxşı olardı

:İmam ona buyurdu

Rəng və həna qoymaq gözəllik əlamətidir, lakin biz əzadarıq (O Həzrətin əzadarlıqdan məqsədi Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin rehləti olub). Bəli İmam Əli (əleyhissalam) Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm matəmində həqiqətən

(.əzadar idi. Belə ki, onun ayrılığından şam kimi yanıb əriyirdi. (Bax ۶۹-cu dastana

## ZİLLƏTƏ SƏBƏB OLAN HƏRKƏTLƏRDƏN ÇƏKİNDİRMƏK-۱۰۶

Həzrət Əli (əleyhissalam) Kufədən Siffeyn cəbhəsinə doğru (Şam nahiyəsi) hərəkət etdi. Yol boyunca Ənbar şəhərindən keçdikdə şəhər kəndxudaları İmama ehtiram əlaməti olaraq öz atlarından yerə enərək (Ənbar camaatı bu

səh:۱۰۹

şəkildə şahlara və böyüklərə ehtiram qoyurdular) Əli (əleyhissalam)-a sarı yüyürüb onun qabağına qaçırdılar. İmam Əli (əleyhissalam) üzünü onlara tutub buyurdu: “Bu ”?hərəkətlərinizin mənası nədir

”.Cavab verdilər: “Bu bir adətdir ki, biz onunla öz başçılarımıza hörmət bəsləyirik

İmam buyurdu: “And olsun Allaha, başçı-larınız belə işlərdən heç bir xeyir görmürlər. Siz isə bu işinizlə özünüzü dünyada məşəqqət və çətinliyə salır, axirətdə isə .bədbəxtliyə sarı sürükləyirsiniz. Ardınca Allah cəzası olan məşəqqətin ziyanı böyükdür

.İnsanı İlahi əzablardan qoruyan sakitliyin sayəsi isə çox faydalıdır

Həzrət Siffeyn cəbhəsindən qayıdıb Kufəyə varid olduqda, Şəbamiyyin qəbiləsi yaşayan küçədən keçirdi ki, arvadların Siffeyn müharibəsində ölənlər üçün ağlamasının şahidi oldu. Bu zaman qəbilənin başçıla-rından Hərb ibni Şərəcil adlı bir nəfər Həzrətin hüzuruna gəldi. İmam ona buyurdu: “Görəsən bu qadınları sakitləşdirə ”!?bilməzsiniz

:Bu vaxt İmam yanınca hərəkət edən Hərbə buyurdu

Sən qayıt, çünki, sənin kimi bir şəxsin mənim kimi adamın yanınca piayada gəlməsi“ ”.hakim üçün qürur, mömin üçün isə zillətdir

Bu tərtiblə İmam Əli (əleyhissalam) yaltaqlıq və xarlıq nişanəsi olan zilləti onlardan .uzaqlaşdıraraq bəşəriyyətə yüksək təbiətli olmağı, özünə qiymət verməyi öyrətdi

### XƏSTƏNİN BAŞI ÜSTÜNDƏ–١٠٧

Həzrətin yaxın silahdaşlarından biri xəstələnmişdi. İmam Əli (əleyhissalam) onun yanına gedib əhvalını soruşdu və ona buyurdu: Allah bu xəstəliyi sənin günahlarının yuyulması üçün səbəb qərar veribdir. Çünki, xəstəliyin heç bir mükafatı yoxdur. Lakin, (səbr edib şikayət etmədikdə) keçmiş günahları aradan apararaq onları ağac yarpağı .kimi tökür

Bunu da bil ki, əcr və mükafat yaxşı danışmaq, eləcə də bədən üzvlərinin əməli ilədir. .Allah öz bəndələrini pak niyyət və qəlblərinə görə behiştə daxil edəcəkdir

.Bu sözdən belə nəticə alırıq ki, xəstəlik keçmiş günahların məhvinə bais olur

:İmam Baqir (əleyhissalam) buyurur

Bir gün Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: “Allah buyurur: Əgər hər kəs üç gün xəstələnərsə və bu üç gündə əyadətinə gələnlərdən heç kəsə şikayət etməzsə Allah onun bədənindəki ətdən daha yaxşı ət qanından daha yaxşı qan bədəninə verər, əgər ona şəfa versəm yaxşı olub, əgər onun ruhunu bədənindən ”.çıxarsam bu halda onu öz rəhmətimə doğru aparmışam

Xəbbab ibni Ərrət İslamın qabaqcıl həqiqi mücahidlərindən idi. O, islamı qəbul edən altıncı adam idi. Bununla belə müşriklərin şiddətli işkəncələrinə məruz qalmış və onlara qarşı əyilməz kimi mübarizə aparmışdı. Heç vaxt İslamdan xaric olmamışdı. Bir neçə dəfə onun başını qızmış dəmirlə dağlamışdılar lakin bütün bunlara baxmayararaq o, öz yolunu davam etdirirdi. O, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin müharibələrində fəal iştirak etmişdi. Həmişə İslamı nəyin bahasına olursa-olsun .müdafiə edirdi

Xəbbab Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən sonra daim Əli (əleyhissalam)-la idi. Nəhayət ۳۷-ci hicri ilində ۷۲ yaşında ikən dünyasını dəyişdi. Öz .vəsiyyətinə əsasən Kufə xaricində torpağa tapşırıldı

.İmam Əli (əleyhissalam) bir danışdığında buyurdu: İslam qabaqcılları beş nəfərdir

.Mən özüm ərəb qabaqcıllarındanam-۱

,Salman Farsi-۲

Suhəyb Rumi-۳

(Xəbbab Nətb (Fələstin-۴

.Bilal isə Həbəşə qabaqcıllarındandır-۵

.İmam Əli (əleyhissalam) öz vəfalı silahdaşını belə xatırladı

”.Allah Xəbbaba bu beş üstün cəhəti olduğuna görə rəhmət eləsin“

.Öz istək və meyli üzündən İslamı qəbul etdi-۱

.Allaha itaətinə görə hicrət etdi-۲

.Sadə yaşayışla kifayətləndi-۳

.Allahdan razı idi-۴

.Bütün həyatı boyu mücahid və yorulmaz bir mübariz idi-٥

Qəribə burasıdır ki, Xəbbabın oğlu Abdullah o qədər Əli (əleyhissalam)-ın xəttində möhkəm durmuşdu ki, kor ürəkli Xəvaric onun özünü, eləcə də hamilə həyat yoldaşını .şəhadətə yetirmişdilər

Əfləh Əli (əleyhissalam)-ın müxlis silahdaşlarından biri idi. Özü də zənci idi. Onun yaxşı müsəlman olmasına baxmayaraq öz həyatında bir dəfə etdiyi oğurluq onu giriftar etdi. Oğurluq etdikdən sonra vicdan danlağı və Allah qorxusu onu bərk narahat etmişdi. Buna görə də tövbə edib öz-özünə dedi. Əli (əleyhissalam)-ın hüzuruna gedərəm, təki .oğurluq cəzasını mənə çəkdirməklə məni günahımdan təmizləsin

O Əli (əleyhissalam)-ın hüzuruna gələrək üç dəfə oğurluğuna etiraf edib onu dilə .gətirdi. İmam Əli (əleyhissalam) da cəza olaraq onun əlinin dörd barmağını kəsdi

O bərk zərbə yalmasına baxmayaraq imanla dolu bir qəlblə Əli (əleyhissalam)-ın .məhzərindən çıxıb evinə tərəf yollandı

Bu arada fürsət axtaranlardan və Əli (əleyhissalam)-ın kinli düşmənlərindən olan İbni Kəvva adlı biri (Nəhrəvan Xəvaricindən idi) öz-özünə dedi: “Yaxşı oldu, indi bu şəxsi Əli .(əleyhissalam)-ın əleyhinə qaldıraram

Öz hiyləsi ilə onun yanına gəlib dedi: Ah, ah, əzizim! Kim sənin nazənin əlini kəsdi? !?Doğrusu nə qədər rəhmsizlik? Nə qədər qan içənlik

Əfləh nurani qəlbə və möhkəm imana malik idi. İbni Kəvvanın xam xəyalının xilafına olaraq Əli (əleyhissalam)-a qarşı elə gözəl sözlər söylədi bazar və camaatın get-gəli :çox olan bir yerdə fəsih dil ilə Əli (əleyhissalam)-ı tərif etməyə başladı. O belə deyirdi

Sağ əlimi o, yeganə Allaha sitayiş edən kəsdi. O, Bədr və Ühüd döyüşündə yalnız atlı idi. Elə bir şəxs ki, Məkkə, Mədinə və Əbtəh diyarı onu öz əzəməti ilə xatırlayır. Əlimi pərhizkarlar rəhbəri Peyğəmbər səllallahu əleyhi və alihi və səlləmin ürəyinin meyvəsi, insan rəhmətinin qayəsi, düşməni əzib ona düz yol göstərən, işıqlı çıraq olan Həzrət Əli (əleyhissalam) kəsdi. Ey camaat! Cəmiyyət hər tərəfdən onu əhatə etmişdi sanki xoş .bəyanlı zirək bir natiq camaata xütbə oxuyurdu

Bu xəbər İmam Əli (əleyhissalam)-a çatdı. İmam onu öz yanına çağırtdırdı ona məhəbbət göstəribetdi və ona dua et. O, dedi: “Ey Əmirəl-möminin! Əgər bədənimi ”.tikə-tikə etsələr belə sənin eşqin qəlbimdən çıxmaz

Digər tərəfdənsə İmam başa düşdü ki, kor qəlbli, imansız olan İbni Kəvva onu bu cür şərrə qaldırmışdır. İbni Kəvva ya buyurdu: “Ey Kəvvanın oğlu, bizim dostlarımız vardır ki, əgər onları tikə-tikə etsək dostluqları nəinki azalmaz, artar və əksinə bizim düşmənlərimiz var ki, əgər bal şəhdini onların boğazına töksək nəinki onlar dost olmaz, əksinə düşmənçiliklərini daha da artırmış olarlar. O adam ki, həqiqətdə bizi ”.sevir qiyamət günündə mütləq bizim şəfaə-timiz ona şamil olacaq

Ruzigarın hadisələrindən biri budur ki, həmin şəxs Nəhrəvan müharibəsində Əli (əleyhissalam) ordusunda şəhadətə yetişdi və canını mövlası Əli (əleyhissalam)-a təslim etdi İbni Kəvva da həmin müharibədə nəhrə-vanların ordusunda həlakətə .yetişdi və cəhənnəmə vasil oldu

Əli (əleyhissalam) buyurur: “Hərgah bu qılıncı elə bir imanlıı adamın burnuna vursam ki, səni gözündə düşmən etsin, düşmən olmayacaq və əgər tamam dünyanı münafiqin boğazına töksəm belə sənin səsinə yenə də səs verməyəcəklər çünki, Peyğəmbər :buyurmuşdu

Ey Əli! Mömin səninlə düşmənçilik etməz, münafiq isə səni sevməz. Bu bir əsas və“ ”.meyardır ki, mömin ilə münafiqi onun əsasında tanımaq olar

## ƏLİ (ƏLEYHİSSALAM) İBADƏT MEHRABINDA VƏ GECƏ YARI NALƏSİ–١١٠

Kufəyə sahib olandan sonra Müaviyənin ən iyrənc hiylələrindən biri bu idi Əli (əleyhissalam)-ın əshabını Şama doğru cəlb edirdi. Sonra ümumi yığıncaqlarda onları məcbur edirdi ki, Əli (əleyhissalam)-dan söz danışsınlar bəlkə onların dilindən Əli .(əleyhissalam)-a aid bir eyb deyilmiş olsun ki, bu da Müaviyənin siyasətini təsdiq etsin

Belə yığıncaqların birində danışdırılan adamlardan biri Zirar ibni Zümrə idi. O, Əli (əleyhissalam)-ın xüsusi və mərifətli yoldaş-larından hesab olunurdu. Əli (əleyhis-salam)-ın şəhadətindən sonra Müaviyə onu (ya təhdid yolu ilə ya da tamahlandırmaq yolu). Şama cəlb etdi. Ümumi məclislərdən birində üzünü ona tutub dedi: Ey Zirar! Əli !(əleyhissalam)-ın ali xüsusiyyətlərindən danış

.Zirar: Məni bu işə qoşma

!Müaviyə: Mütləq gərək Əli (əleyhissalam)-ın vəsflərindən deyəsən

Zirar: İndi ki məcbur edirsən, naçaram Əli (əleyhissalam)-ın bir sıra sifətlərinə işarə :edim

Əli dindarlara ehtiram edirdi və onun adamlara hörmət meyarı din və imana-١ .əsaslanırdı

Kasıblara və yoxsullara özünü daha yaxın hesab edir, varlıların sərvətinin onun-٢ .yanında hörməti yox idi və ona etina etməzdi

.Güclü, zor sahibi və qüdrətli şəxs o Həzrətə nüfuz etməyə qadir deyildi-٣

O, gücsüzlərin ümidini ədalət və özlərinin haqlı hüququndan kəsmirdi. Eləcə də-۴ !onların haqqını hüquq qarətçilərindən alırdı. Hətta onlar güclü və quldur olsalar da

Ziararın sözü buraya yetişdikdə dedi: Şəhadət verirəm ki, bir gecə yarıdan keçmiş idi. Qaranlıq və zülmət pərdələri dünyaya yayılmışdı. O mehrabda durub saqqallarını :tutmuşdu və ilan vurmuş adam kimi qıvrılır ağlayır və deyirdi

Ey dünya, ey dünya! Məndən uzaqlaş! Özünü mənə göstərirsən? Yoxsa məni şövqə " gətirmək istəyirsən?!" Hələ sənin mənə nüfuz edə biləcəyin zaman gəlib çatmamışdır. Heyhat,, (məndən uzaqlaş,) başqasını aldat. Mənim sənə ehtiyacım yoxdur. Mən sənə üç dəfə talaq vermişəm. Daha geriyə dönüş yoxdur. Sənin həyatın qısa mövqeiyyətin .az, arzun alçaq və heçdir

Ah ömrün azlığından, yolun və səfərin (axirət) uzunluğundan və məqsədin isə“ ”!böyüklüyündən

Burada idi ki, hiyləgər Müaviyə ağladı və dedi: Allah Əbul Həsənə (Əli (əleyhissalam)-a) ?rəhmət eləsin. Bəli, o, elə idi, ey Zirar! İndi de görüm, ondan ayrı sənin qəmin neçədir

:Zirar dedi

”.Mənim qəmim, balasının başı qucağında bədənindən ayrılan ananın qəmi kimidir“

## QƏZA VƏ QƏDƏR BARƏDƏ QOCANIN SUALINA CAVAB

Əsbəğ ibni Nəbbatə deyir: Siffeyn müharibəsindən sonra İmam Əli (əleyhissalam) .Kufəyə qayıtdı və bir ümumi məclisdə əyləşdi ki, əshabı da orada idilər

Birdən bir qoca kişi yaxın gəlib və o Həzrətin qabağında iki dizi üstündə əyləşdi. Həzrətlə hal-əhval tutduqdan sonra sual etdi: “Ya Əmirəl-Möminin! Bizim Siffeyn ”?cəbhəsinə gedib qayıtmağımız məgər Allahın qəza və qədəri əsasında idi

İmam cavabında buyurdu: “And olsun o Allaha ki, dənəni yardı, dünyanı və canları yaratdı. Biz Allahın qəza və qədəri olmadan nə bir addım atmadıq, nə də mənzil ”.etmədik

Qoca kişi dedi: “Elə isə bu yolda çəkdiyim zəhməti Allahın hesabına qoyum və daha heç ”?bir savabım olmayacaqdır

İmam buyurdu: “Sakit ol! Allah bu səfərdə bizə böyük imkanat əta etmişdir. İstər ”.cəbhəyə getməkdə, istərsə də qayıtmaqda və siz məcbur deyilsiniz

”!?Qoca kişi dedi: “Axı bizi qəza və qədər” hərəkətə gətirdi

İmam buyurdu: Vay olsun sənə, bəlkə sən güman edirsən ki, qəza və qədər dedikdə məqsəd icbari (hökm və hər şeyin qədərini, ölçüsünü müəyyən edən) qəza və qədərdir? Əgər belə olarsa, ilahi və”də və əzab, savab və cəza əbəs olar. Allah taala insana ixtiyar vermiş, onu müəyyən şeylərdən çəkindirmiş, müəyyən işlərə əmr etmiş; ona asan vəzifələr vacib etmiş, heç vaxt çətin və üzücü əməlləri görməyə vəzifəli

etməmişdir. O, az əməl müqabilində çoxlu mükafat əta etmişdir. Heç vaxt bir kimsə icbar üzündən Ona qarşı üsyankarlıq etməmişdir, həmçinin, Ona itaət də icbar .üzündən olmamışdır. O, asimani kitabları əbəs yerə nazil etməmişdir

:Sonra həzrət “Sad” surəsinin ٢٧-ci ayəsini tilavət etdi

”!Bu əqidə kafirlərin gümanıdır, vay olsun kafirlərə Cəhənnəm oldundan“

.Qəza və qədər Allahın əmri və göstərişi mənasındadır

:Sonra bu ayəni oxudu

Rəbbin fərman verib ki, Ondan başqa heç kəsə ibadət etməyəsiniz.”(١)(Buna əsasən“ .(qəza və qədər bəzən hökm və əmr mənasındadır

O, qoca kişi mətləbi anladıqdan sonra sevincindən ayağa qalxdı və İmam Əli .(əleyhissalam)-ın mədhinə şerlər oxuyub getdi

## YUXU YA GECƏNİ YUXUSUZ KEÇİRMƏK–١١٢

Gecənin dörddə biri keçmişdi ki, Əmirəl-möminin Əli (əleyhissalam) Kufə məscidindən çıxdı və mənzilinə tərəf yollandı. Kumeyl ibni Ziyad ki, Həzrətin müxlis və xüsusi əshabından idi o Həzrətlə birgə hərəkət edirdi. Yolda bir kişinin evinin yanına çatdılar. Onun evindən Quran səsi eşitdilər. O, gecə yarı yuxudan durmuş və Quran oxuyurdu. :Bu ayəni isə ürəyinə yatan səs və ürək yanğısı ilə oxuyurdu

Məgər gecə yarı Allaha itaət edib səcdə və qiyamı yerinə yetirən axirətdən qorxaraq“ Allahın rəhmətinə ümidvar olanlar günah və küfr içində yaşayanlarla (bərabərdirlərmi?”(٢

Kumeyl qəlbində bir ah çəkdi. Gecə yarı gecəni yuxusuz keçirən bir insanın dodaq-.larından çıxan Quranın ürəyə yatan səsi onu sevindirsə də bir şey demədi

İmam Kumeylə baxıb buyurdu: “Bu şəxsin ürəyə yatan səsi səni aldatmasın. Bu Quran oxuyan şəsx cəhənnəm əhlindəndir ki, tezliklə bu mətləbin sirrini sənə xəbər ”.verəcəyəm

Kumeyl bu sözdən təəccübləndi. Bu hadisədən bir müddət keçdi. Belə ki, Nəhrəvan xəvari-cinin əhvalatı qabağa gəldi ki, Əli (əleyhis-salam)-ın əleyhinə müharibə elan etdilər və nəhrəvan diyarından Əli (əleyhissalam)-ın ordusu ilə xəvaric ordusu arasında qanlı müharibə baş verdi və bütün xəvaric ٩ nəfər qaçqından başqa bu .müharibədə öldürüldülər

Kumeyl də cəbhədə Əli (əleyhissalam)-ın silahdaşı idi. Əli (əleyhissalam) qılıncından qan axdığı halda üzünü Kumeylə tutub buyurdu: “Mənimlə gəl” Sonra hər ikisi birlikdə kəsilmiş başlar və öldürülənlərin yanına gəldilər. Əli (əleyhissalam) qılıncının ucunu ölənlərin başına qoyurdu. Belə ki, qılıncının ucunu həmin kecə Quranı tilavət edənin də

başına qoyub buyurdu: “Ey Kumeyl! Bu həmən şəxsin başıdır ki, gecə yarı “əmmən ".huvə qanitun anaəl-ləyli..." ayəsini oxuyurdu və səni özünə cəzb etmişdi

Kumeyl İmamı öpüb özünün cahilanə arzusundan istiğfar etdi. İmam Əli (əleyhis-salam) xəvaricdən bir kişinin Səruriyyə (Nəhrəvanın yaxınlığında sərurə mənsub) gecə :namazını qılıb Quran tilavət etdiyini eşitdikdə buyurdu



---

İsra" surəsi, .۲۳۰-cu ayə"[۲۵] -۱

Zumər" surəsi, ۹"[۲۶] -۲

Yəqin və imanla həmrah olan yuxu şəkkli namazdan yaxşıdır.” Ehtimal verilir ki, bu söz“ .həmin Nəhrəvan müharibəsində öldürülən Quran qariəsinə aiddir

### ƏLİ (ƏLEYHİSSALAM)–IN SADƏ YAŞAYIŞI–١١٣

İmam Əli (əleyhissalam)-ın xilafət və rəhbərliyi vaxtında müsəlmanlar bir çox qələbələr qazanmış və bunun da nəticəsində yaxşı imkanlar sahibinə çevrilmişdilər. Belə ki, saysız-hesabsız qənimətlər hər tərəfdən Kufəyə doğru axır, camaat isə istənilən gözəl iqtisadi vəziyyətdə yaşayırdı. Elə bu zamanda idi ki, bir şəxs İmam Əli (əleyhissalam)ın köhnə və yamaqlı paltar geydiyini görüb təəccübləndi və bu barədə .İmam (əleyhissalam)-la danışdı

:İmam cavabında buyurdu

Bu köhnə paltarı geymək xaşe qəlbi və əmmarə nəfsi xar edir ki, möminlər ondan“ ”.ibrət alırlar

Burada aşağıdakı dastana diqqət etməyimiz yerinə düşər: Rəvayətlərdə gəlib, bir gün Əli (əleyhissalam) öz şəmşirini bazara gətirib dedi: “Kim bu şəmşiri məndən alar?!” Bir şəxs qabağa gəldi və Həzrətlə şəmşiri satmaq barədə söhbət etdi. İmam (əleyhissalam) buyurdu: “And olsun Allaha, əgər bir köynək almağa çatası pulum ”!olsaydı şəmşirimi heç vaxt satmazdım

O şəxs dedi: “Mən hazıram ki, sənə nisyə göynək satam və sən də vaxtı çatanda ”.köynəyin pulunu mənə ödəyəsən

İmam (əleyhissalam) bu təklifi qəbul etdi və köynəyi ondan nisyə aldı. Bir müddətdən .sonra öz maaşını aldıqda köynəyin pulunu satıcıya ödədi

Baxmayaraq ki, beytül-maldan minlərlə dirhəm və başqa əmlak İmam (əleyhissalam)-ın ixtiyarında idi, bununla belə Həzrət beytül-malın sərf olunmasından o dərəcədə ehtiyat edirdi ki, bir gecə Əmr As o Həzrətin hüzuruna gəldikdə İmam (əleyhissalam) .beytül-maldan olan çırağı söndürdü və ayın işığından istifadə etdi

### XAİF–GECƏNİ YUXUSUZ KEÇİRƏN–١١٤

Nuf ibni Füzzalə Bekali Himəyrə qəbiləsindən olub Bekal-Yəmən kəndinə mənsub idi. Əli (əleyhissalam)-la oturub-durmaq ona nəsib olmuşdu və Əli (əleyhissalam)-ma çox yaxın bir şəsx idi. O deyir: "Bir gecə yarısı Əli (əleyhissalam)-ı gördüm ki, yuxu yatağından qalxıb göyün ulduzlarına baxır. Daha sonra mənə buyurdu: "Ey Nuf, yuxudasan, yoxsa oyaq?!" Dedim: "Oyağam, ulduzlara baxıram".

Buyurdu: "Ey Nuf! Xoş zahidlərin səadətinə–dünyada yetginlərin və axirət dünyasına müştaq olanların halına. Onlar ki, yeri özləri üçün dincəlmək, məkanı, onun torpağını özləri üçün yataq, və suyu ətir yerinə qəbul etmişlər. Eləcə də Quranı özlərinin Alt paltarı, və duanı üst paltarı, dünyanı isə məsih (əleyhissalam) nümunəsi seçmişlər".

Ey Nuf! Davud (Peyğəmbər) (əleyhissalam) gecənin belə bir saatında əlini Allah dərgahına duaya götürdü və dedi: “Doğrusu bu həmən saatdır ki, heç bəndə onda dua etmir, məgər ki, duası müstəcab olasun.” Məgər o adamın duası ki, zalım dövlət başçısı üçün vergi yığmağa, ya məxfi casus ya intizami məmur (zülm dəstgahı üçün) ya dənbəkçi ya (başçılar üçün haramsaz və avazda) təbilçisi ola ki, belə adamların duası .müstəcab olmaz

### HAL–ƏHVAL SORUŞMAĞIN CAVABI–۱۱۵

”!?Bir şəxs İmam Əli (əleyhissalam)-ın hüzuruna gəlib dedi: “Sizin halınız necədir

:İmam cavabında buyurdu

Necə olacaq bir kəsin halı ki, bu dünyada yaşamaqla fani olur, öz sağlamlığı ilə xəstə“ ”.olur və əmin-amanlıq pənahgahında isə ölüm onu haqlayır

### DƏFN ZAMANI GÜLÜŞ–۱۱۶

Bir nəfər müsəlman dünyadan getmişdi. Müsəlmanlar yığılıb onun dəfnində iştirak etdilər. İmam Əli (əleyhissalam) da o dəfn mərasimində iştirak edirdi. Dəfn zamanı həzrət birdən iştirak edənlərdən birinin güldüyünü gördükdə narahat oldu və üzünü :ona tutub buyurdu

Sanki ölüm bizlərdən başqası üçün müqəddər, haqq isə başqaları üçün vacib“ olmuşdur. Sanki gördüyümüz bu ölülər səfərə gedirlər tez də qayıdacaq. Onları qəbrin çökəkliyinə qoyur və onların miras qalmış mallarını yeyirik. Belə xəyal edirik ki, onlardan sonra biz daim bu dünyada qalacağıq (sənin gülüşün və şadlığın bunu göstərir). Sanki biz nəshəti və nəsihət verəni yaddan çıxarmışıq. Hansı ki, hər hansı bir ”.hadisə və bəlanın hədəfiyik

Beləliklə, Əli (əleyhissalam) camaatı cənazənin arxasınca gülməkdən çəkindirdi və bizə öyrətdi ki, bu halda axirət səfərinin fikrində olub öz qürurlarımızı sındırmaqla bu yol .üçün töhfə və hədiyyə hazırlayaq

Nəhayət Həkəmeyn macərası və Əbu Musa Əş”ərinin aldanması sona yetdi. Arada isə rüsvayçı bir müqavilə bağlandı. Bununla belə İraq ordusu Siffeyn cəbhəsində idilər və gərək döyüşçülərin əhval-ruhiyyəsini yüksək səviyyədə saxlamaq lazım idi ki, həm .fikirləri dağılmasın həm də zalımlarla müharibədə süst və qüdrətsiz olmasınlar

Ancaq, birdən gözəl bir şüar-amma zəhərli hədəflə ürəyi ölülərin boğazından çıxdı və Həkəmeyn sazişinə etiraz əlaməti olaraq Siffeyn müharibəsi cəbhəsində bu şüarı ələm .etdilər ki: “Hökm Allahdan başqa heç kimə rəva deyil

Hər ləhzə keçdikcə bu şüar orduya daha çox təsir edirdi və o qədər təhlükəli nəzərə çarpırdı ki, Əli (əleyhissalam) buyurmuşdu: “Hər kəs bu şüarı desə onu öldürün. Hərçənd mənim əmmaməmin altına pənah gətirmiş olsa da. Çünki, bu “azdırıcı” İraq ordusunun arasında təfriqəyə səbəb oldu.” Əş”əs ibni Qeys kimi adamlar bu şüarı .daha da qızışdırdılar. Sanki şüarı vermək üçün Müaviyədən kalan rüşvət almışdılar

Yavaş yavaş bu şüar Əli (əleyhissalam)-ın ordusu başçılarından bəzilərini müharibəni davam etdirməyə qarşı soyuq və laqeyd etdi. Get-gedə İraq əsgərləri arasında təşviş .və iztirab meydana çıxdı

Baxmayaraq ki, müharibənin taleyi onların əlində, idi, vəli ordularının nizam-intizamı .həmin yanmış fikirlər nəticəsində pozul-muşdu və dağılmaq təhlükəsi qarşısında idi

İş o yerə çatdı ki, İraq ordusunun Siffeyn qərargahında qalması tamamilə mənasız və nəticəsiz nəzərə çarpdı. İmam Əli (əleyhis-salam) Kufəyə qayıtmaq əmrini verdi. Əsgərlər soyuqqanlıqla döyüş vəsaillərini yığıb Kufəyə yola düşdülər. Əli (əleyhissalam) qəmə qərq olmuşdu. Elə bir qəm ki, kor qəlbli və vəfasız arxadaşların qəfilliyindən düşmənlə müharibə əvəzinə təfriqə yolu və xətakarlığı özü üçün məqsəd .seçmişdi

Budur, ordu Kufəyə qayıdır, çox adamlar isə şəhid olublar. Bunlardan daha pisi bu idi ki, birdən təfriqəçilər öz-özlərinə dedilər: “Biz, şüarı verdiyimizdən Əli (əleyhissalam)-ın tərəfdarları ilə Kufəyə daxil omağımız düzgün deyil. Bəs, ordaca öz yollarının istiqamətini dəyişdilər və Sərəvra məhəllinin kənarında yığışdılar. Təqribən on min

nəfər Əli (əleyhissalam)-ın dünənki, arxadaşla-rından və bu gün o Həzrətin kinli düşmənlə-rindən olan adamlar Nəhrəvana getdilər və Əli (əleyhissalam)-la müharibə elan etdilər. Əli (əleyhissalam) eləcə sakit idi. Çünki əksüləməl göstərməsi səlah deyildi. Ona görə ki, Siffeyn hadisəsinin yorucu olub nəticəsiz qalması İraq ordusunun iki qrupunun müharibəsi Kufə camaatının gözündə çox dərd gətirici idi. O Həzrət müxaliflərin küframiz, aldadıcı və pozucu şüarlarına etina etmədi ta ki, öz ordusunu .Kufə darvazasına çatdırdı

Bu vaxt Kufə qəbiristanlığı Əli (əleyhis-salam)-ın nəzərini özünə cəlb etdi. Bu halda fürsəti münasib gördü diri ürəkli ölülərlə söhbət etsin, bəlkə bu iş dirilərə ibrət və xəbərdarlıq olsun və onlarda sonu fikirləş-məklə həvəslərdən və təmələrdən azad .olub haqq bayrağı altında iztirabsız baqi qalsınlar

Bəziləri yazırlar: Kufə camaatı öz ölülərini evlərinin qabağında dəfn edirdilər. Xəbbab ibni Ərrət, Peyğəmbər və Əli (əleyhis-salam)-ın pak və həqiqi arxadaşı xəstəlik ,yatağına düşmüşdü. Vəsiyyət etdi ki, məni Kufədən xaricdə dəfn edin. O

dünyadan getdi və vəsiyyətinə əsasən onu Kufənin xaricində dəfn etdilər və ondan ”.sonra camaat vəsiyyət edirdilər ki, Xəbbabın qəbrinin kənarında dəfn olunsunlar

Təqribən yeddi ya səkkiz qəbr Kufədən xaricdə görünürdü. İmam (əleyhissalam) qəbrlərin niyə burada qazılmasını soruşduqda bir nəfər dastanı onun üçün şərh etdi. İmam (əleyhissalam) buyurdu: “Allah Xəbbaba rəhmət eləsin ki, yaxşı vəsiyyət etmişdir. O, özünün meyli və rəğbəti ilə İslamı qəbul etmiş öz meyli ilə hicrət etmiş və bütün həyatı boyu fəal döyüşçü olmuşdur. İslam yolunda bir çoxu bəlalara dözdüyündən mükafatı Allah dərgahında məhfuzdur.” Hər halda İmam (əleyhissalam) qəbirlərin yaxınına gəldi və onların bərabərində dayanıb bu cümlələrlə qəbr sakinlərini :ziyarət etdi və onlarla belə danışdı

!Ey qorxulu evlərin sakini, boş yerlər və qaranlıq qəbirlər. Ey torpaq altında yatanlar“

Ey vətəndən uzaq düşmüşlər! Ey vəhşət və tənhalıq əhlləri. Siz bizim qabaqda gedənlərimizsiniz ki, qabaqca gedibsiniz və biz ,sizin ardıcıllarınızıq ki, sizə qovuşacağıq. Sizə deyim ki, sizin evlərinizdə başqaları sakin oldular və başqaları sizin :arvadlarınızla evləndilər və sizin mallarınızı böldülər.” Sonra buyurdu

”!?Bu bir xəbər idi ki, biz bilirdik, bəs sizdən nə xəbər“

:Ondan sonra üzünü yoldaşlarına tutub buyurdu

Agah olun! Əgər onlara danışmaq icazəsi verilsəydi bizə deyərdilər axirət səfərinin ən“ ”!yaxşı azuqəsi təqva və pərhizkarlıqdır

### !?ÖZÜNÜ SINDIR GÜZGÜNÜ NİYƏ SINDIRMAQ–۱۱۸

Baxmayaraq ki, bir kişi dünyanın maddi işlərinə qərq olmuşdu, amma camaatı aldatmaq üçün ah və nalə ilə dünyaya pis baxır və onu sərzəniş edirdi. (Məsələn (...deyirdi: Ey namünasib ruzigar, ey alçaq dünya və s

İmam Əli (əleyhissalam) onun öz işlərinin günahını dünyanın boynuna atdığını :gördükdə buyurdu

Ey dünyaya pis deyən kişi və onu alçaq hesab edən adam! Baxmayaraq ki, özün“

!dünyaya aldanmısan və onun bihudəliklərinin düşkünü olmusan

Məgər özün dünyaya aldanmamısan ki, onu sərzəniş edirsən?!" Sən gərək dünyanı günahkar biləsən yoxsa dünyanın səni günahkar bilməyə haqqı vardır?! Nəvaxt dünya sənə aşiq oldu? Nə vaxt və harada səni aldatdı? Səninlə hansı naz və qəmzəni etdi? Olmaya səni atalarının çürümüş cəsədləri ilə aldatdı? Yoxsa analarının qəbrin içərisində yatdığı yer səni məğrur etdi? Nə

qədər onların diri qalmaları üçün əl-ayağa düşdün və müalicəyə üz tutdun ki, o zəhmətlərin səmərəsiz qaldı və sənin ağlayıb sızlamağın heç bir fayda vermədi. Belə ki, onların ölümünün qarşısını ala bilmədin və dünya isə elə həmin mənzə-rələrlə öz ...gələcəyini mücəssəm etdi və qətligahını nişan verdi

Lakin bil, həmin dünya sidq səfa və düzlük yeridir. Bu da elə bir adamlar üçündür ki, onunla düzlük, səfa-səmimiyyətlə davranıblar. Dünya sağlamlıq evidir o kəslər üçün ki, onu dərk edələr. Eləcə də ehtiyacsızlıq evidir o adamlar üçün ki, ondan düzgün istifadə .edələr. Nəsihət yeridir onlar üçün ki, nəsihət qəbul edən qəlbləri olmuş olsun

Dünya Allahın dostlarının məscidi, yarada-nın mələklərinin namazqılan yeri və Allahın vəhyinin nüzul olduğu yer. Eləcə də Allah övliyalarının ticarətgahıdır. Onlar həmin ...dünyada Allahın rəhmətini kəsb edərək və behişti qazanırlar

Buna görə də dünya bir güzgüdür ki, yaxşı və pisi göstərir və əgər insan özü pis olarsa "?!güzgüyə pis deməməlidir ki, deyiblər: "Özünü sındır güzgünü sındırmaq niyə

## BÖYÜK İNSANDAN BÖYÜK NƏSİHƏT–١١٩

Kumeyl ibni Ziyad İmam Əmirəl-möminin Əli (əleyhissalam)-ın ən yaxşı və ona vurğun arxadaşlarından biri idi. O deyir: Bir gün Əmirəl-möminin əlimi tutdu və məni Kufə qəbristanlığına tərəf apardı. Səhraya yetişəndən sonra çox qəmli və dərdli bir ah çəkib :və buyurdu

Ey Kumeyl ibni Ziyad! Bu ürəklər elə qablardır ki, onların ən yaxşısı daha geniş və" "...böyük olandır. Buna görə nə deyirəmsə, onu yadda saxla və ürəyinə tapşır

:Ey Kumeyl! Camaat üç növdür"

Rəbbani alimlər və yaxşı əməl sahibləri-١

.O bilik axtaranlar ki, nicat əldə etmək yolundadırlar-٢

Balaca milçəklər, gücsüzlər və iradəsizlər ki, qəzəb dalınca gedirlər və hər küləklə-٣ yellənirlər. Bu qrup elm və bilik nurundan faydalanmırlar və möhkəm sütuna pənah aparmırlar. Ey Kumeyl! Elm maldan yaxşıdır, çünki elm səni qoruyur, amma malı sən

İslam Peyğəmbərinin rehlətindən sonra o həzrətin xəlifəsini təyin etmək cərəyanı araya gəldikdə camaat Səqifeyi bəni Saidədə yığışdılar. Əbu Bəkr Ömərə dedi: “Əlini ver, səninlə beyət edim.” Ömər cavab verdi: “Sən Peyğəmbərin həmin arxadaşısan ki, asayiş və çətinlikdə həmişə o Həzrətlə olurdun. Sən əlini ver ki, mən səninlə beyət ”.edim

Əbu Bəkr Ənsarın bərabərində öz xilafəti üçün belə dəlil gətirdi: “Biz Peyğəmbərin ”.itrəti və onu qoruyanlarıq ki, onu müdafiə edirik

Və onunla beyət olunduqdan sonra camaatın bərabərində hüccət gətirdi ki, bu beyət .şuranın mətnindən, əqd və həll əhlindən olubdur

:Məşhur əhli təsənnün alimi Əbil-Hədid yuxarıdakı mətləbi qeyd edəndən sonra deyir

Əli (əleyhissalam)-ın etirazı yuxarıdakı cərəyana aiddir. Elə isə Əli (əleyhissalam)-ın .sözünün əslinə diqqət edin

:O Həzrət buyurdu

”!?Əcəba! Məgər xilafət Peyğəmbərlə oturub durmaq ya qohumluqla hasil olur“

İbni Əbil Hədid deyir: Əli (əleyhissalam)-ın bu etirazamiz sözü Ömər ibni Xəttab barəsindədir ki, Əbu Bəkrə dedi: “sən həmən arxadaşısan..” Etiraz buna idi ki, əgər arxadaş olmaq” xilafətin düzgün meyarıdırsa, bəs mən arxadaşlı baxımından Peyğəmbərə daha yaxınam. Əlavə olaraq Peyğəmbərlə mühüm qohumluğum da vardır. Buna görə mən hamıdan müqəddəməm. Sonra Şərif Rəzi Əli (əleyhissalam)-:dan bu zəminədə bir şer nəql edir və o da budur ki, buyurdu

Əgər sən şura yolu ilə xalqın hakimi oldunsa, bu nə şuradır ki, onda məşvərət“ .tərəfdarları (mənim kimi) qaib idilər

Yox əgər Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmə yaxın qohum olmağı dəlil ”.gətirdinsə başqaları səndən daha yaxındırlar

:İbni Əbil Hədid yazır

.Bu iki etirazamiz şer Əbu Bəkrə olunan xitabdır

## RƏHBƏRLİK BİRLİYİ–۱۲۱

Təlhə və Zübeyr Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm yaxın əshablarından, seçilmiş və ləyaqətli şəxsiyyətlərindən idilər. Hətta Ömərin özü ölərkən altı nəfəri təyin etdi ki, özündən sonra xilafətdə bir nəfəri seçsinlər. Elə ki, camaat yığışdılar və İmam Əli (əleyhissalam) ilə beyət etdilər, bu iki nəfər də onların arasında idilər. Camaat yığılandan sonra İmam Əli (əleyhissalam) ilə beyət edərkən həmin iki nəfər də beyət edənlərdən idilər. Amma nəfsani həvəslər bais oldu ki, bu iki nəfər Əli (əleyhissalam)-ın hüzuruna gəlib təklif etsinlər ki, Həzrət xilafət işində onları da şərik etsin. (və

müsəlmanlara rəhbərlik Əli (əleyhissalam) Təlhə və Zübeyrdən ibarət üç nəfərlik şura :ilə yerinə yetirilsin). Əli (əleyhissalam)-a ərz etdilər

Biz səninlə beyət edirik bu şərtlə ki, sənin xilafət və rəhbərliyindəki işlərdə şərik olaq.”“ :İmam (əleyhissalam) onlara belə cavab verdi

”.Yox, siz yalnız çətinlik və zəiflik zamanı təqviyyət, kömək və yavər olarsınız“

## HƏZRƏTİ MƏHDİ ƏLEYHİSSALAMIN DÜNYƏVİ ZÜHURU BARƏDƏ MÜJDƏ–١٢٢

:İmam Əli (əleyhissalam) bir gün camaata xitabən buyurdu

Hökmən dünya dönüklük və ipə-sapa yatmazlıqdan sonra onu sağana süd“ verməkdən çəkinən və onu balası üçün saxlayan tünd xasiyyətli dəvə kimi bizə tərəf ”.üz gətirəcək və bizə mehriban olacaqdır

:Sonra “Qəsəs” surəsinin ٥-ci ayəsini tilavət buyurdu ki

Bizim iradəmiz bu qərarladır ki, dünya yoxsullarına (kamil nemət) minnəti bəxş edək“ ”.və onları yer üzünün rəhbər və varisləri qərar verək

Şiə alimləri ilə birlikdə bu sözü yuxarıdakı ayəyə qoşmaqla İmam Məhdi (əleyhissalam)-ın qiyamına bir işarə dir. Buna görə ki, yalnız o Həzrətin dünya hökuməti zamandındadır ki; “Dünya müstəzəfləri hakimiyyəti ələ alarlar və yalnız o zamandadır ki, camaat iştiyaq və mehribanlıqla Əli və ali Əli (əleyhissalam) məktəbinə doğru üz tutarlar. (Buna əsasən biz gərək belə böyük hökumətin zəminəsini qoymaq üçün himmət edək) və yuxarıdakı ayədə müstəzəflərin hökumət-lərinin Həzrət Musa (əleyhissalam)-ın rəhbərliyi altında Firon və fironçuların əleyhinə yaranan hökumətin nəvididir ki, ilahi hökumətə müjdə verir və tağutların müqabilində mövqe tutaraq onları tarixin zibilxanasına tullayır. Məgər belə bir hökumət Ali Muhəmmədin Həzrəti Məhdisinin səlləllahu əleyhi və alihi və səlləm dünya hökumətindən başqası ola !?bilərmi

:Bu ayə və bundan sonrakı ayə beş mühüm mövzuya işarə edir

Allah müstəzəfləri kamil nemətə çatdırır (١

۲) Onları xalqın rəhbəri edir

۳) Onları zalımların hökmünə varis edir

۴) Onlar qüdrətli və möhkəm hökumət sahibi olacaqlar

۵) Allah onların qüdrətini düşmənlərə göstərir.

Yuxarıdakı beş mövzuya diqqət və xüsusilə də Əli (əleyhissalam)-ın sözündəki “ələyna” kəlməsinə diqqət et (biz əhl-beytə tərəf üz döndərirlər) Buna əsasən !yuxarıdakı söz Həzrət Məhdi (ə.c)-ın müslih hökumətinin yaranmasına aid nəviddir

## YEDDİ SUALA CAVAB–۱۲۳

Məhzər elm və irfan məhzəri idi. Bu vaxt haqq aşiqləri pərvanə kimi Əli (əleyhissalam)-:ın ətrafına toplaşmışdılar. Bir şəxs o Həzrətdən soruşdu

?Ağıllı insanı kimdir”(۱

”.İmam cavabında buyurdu: “Aqil o kəsdir ki, hər işi öz yerində görür

”.O, soruşdu: “Cahil və nadan insanı da bizim üçün vəsf et (۲

İmam buyurdu: “Cahil aqilin əksinədir və o elə bir kəsdir ki, şeyləri öz yerində qərar ”.vermir

Başqa bir şəxs sourşdu: “Allah qiyamət günü bu qədər çox və hesabsız olan ( ۳ ”?insanların hesabına necə yetişəcək

İmam (əleyhissalam) buyurdu: “Allah onların hesabına necə yetişər bir halda ki, onlar ”!Allahı görmürlər

İmam (əleyhissalam) buyurdu: “Necə ki, onlara ruzi verir bir halda ki, onlar onu ( ۴ ”.görmürlər

Başqa bir şəxs soruşdu: “Ya Əmirəl-möminin! Hansı vasitə ilə döyüş meydanlarında (۵ :öz tərəf müqabillərinə qalib gəldin?!” İmam (əleyhissalam) cavabında buyurdu

”.Mən hər kəslə üzbəüz oldumsa o, mənim əleyhinə özünə kömək etdi“

Şərif Rəzi deyir: “İmamın məqsədi o Həzrətin cəlal və heybətidir ki, düşmənin qəlbində qorxu və vəhşət icad edirdi. Eləcə də düşmənin özü o Həzrətə öz əleyhinə kömək ”.edirdi

Başqa bir şəxs soruşdu: “Ədalət daha yaxşıdır ya sərvət? İmam (əleyhissalam) ( ۶

cavabında buyurdu: “Ədalət hər şeyi öz yerində qərar verir, amma səxavət onu ədalət sərhədindən daha yuxarı aparır. Ədalət ümumi qanundur lakin səxavət xüsusi xarakter daşıyır. Buna görədə ədalət səxavətdən daha yaxşı və ondan daha ”.şərafətlidir

Başqa bir şəxs isə belə soruşdu: “Məşriqlə məğrib arasındakı fasilə nə qədərdir?” (٧ ”.İmam (əleyhissalam) cavabında buyurdu: “Günəşə olan bir günlük yol qədər

## ƏLİ ƏLEYHİSSALAMIN NƏZƏRİNDƏ PEYĞƏMBƏRİN ŞÜCAƏTİ–١٢۴

Hicrətin ikinci ili idi. Böyük Bədr müharibəsi İslam ordusu ilə Şirk ordusu arasında başlandı. Çox bərk və əzici bir müharibə! Bu müharibədə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm qoşununun baş komandanı idi. Düşmənin qəhrəmanları meydana .gəlmişdilər. Kafirlərin qoşununu sayı min nəfərdən artıq idi

Bir halda ki, islam diviziyasının adamlarının sayı ٣١٣ nəfərdən artıq deyildi. Bu bərabər olmayan müharibədə Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm düşmənin müqabilində elə durmuşdu ki, İmam Əli (əleyhissalam) bu barədə şücaətlə belə :buyurur

Hərgah müharibə alovu bərk şölələnirdi və zəbanə çəkirdi, biz Peyğəmbər səlləllahu“ əleyhi və alihi və səlləmə pənah aparırdıq və bizlərdən heç kəs düşmənə o Həzrətdən yaxın deyildi.” Doğrusu bu nə şücaətdir ki, qəhrəmanlar qəhrəmanı Əli (əleyhissalam) döyüş meydanında ona pənah aparırdı! Sədi demişkən: “Ümmət divarına nə qəm ki, ”.əgər sənin kimi arxası olsa, dəniz dalğasından nə qorxu, əgər onun gəmiçisi Nuh olsa

### ÜÇ NƏFƏR TAMAŞAÇI–١٢٥

Əli (əleyhissalam) işləri idarə etməkliyi əlinə alandan sonra rəsmən müsəlmanların xəlifəsi oldu. Bir xeyli adam onunla beyət etmədilər. O cümlədən üç nəfər də var idi ki, kənara çəkildilər və Əli (əleyhissalam)-a kömək etmədilər. Əli (əleyhissalam) öz xilafəti .dövründə çətin hadisələrlə üzləşsə də onlar duvub tamaşa etdilər

Bununla da nə haqqı himayət, nə də batili xar etdilər. Nəhcül-bəlağədə bu üç nəfər :tamaşaçıya işarə olunubdur ki, ibarətdirlər

Səd ibni Əbi Vəqqasdan (Səd ibni Malik ibni Vəhib) ki, s islamın şücaətli-١ şəxsiyyətlərindən idi. Bədr və Ühüd müharibəsində fəal iştirak etmiş və Ömər ibni Xəttabın xilafəti dövründə islam qoşunları onun sərkərdəliyi altında Qadsiyyə və Mədaini fəth etmişdi. O, ٥٠ ya ٥٥ hicri ilində Müaviyənin onun xörəyinə qatdığı zəhərlə !dünyadan getdi

Səd ibni Vəqqas o cümlə kəslərdəndir ki, Əli (əleyhissalam)-la beyət etmədi və o .Həzrətin Qasitlər və Nakislər-lə müharibəsində iştirak etmədi

Hətta Əmirəl-möminin Əli (əleyhissalam) Mədinənin hakiminə yazdı ki, Səd ibni Əbi .Vəqqas və Əbdüllah ibni Öməri beytül-mal payından məhrum et və bu dəstur icra oldu

Səd və Əbdüllah, Əli (əleyhissalam)-ın hüzuruna gəlib öz paylarını ondan tələb etdikdə. İmamın onlara son sözü bu oldu: “Siz xilafkarsınız ki, əmr be məruf və nəhy əz münkər

etmədiniz. Bizimlə və düşmənlərimiz arasında islah vermədiniz və zalımlar ilə ".döyüşmədiniz. Ona görə sizin beytül-maldan payınız yoxdur

Səd baxmayaraq ki, Əli (əleyhissalam)-ın məqamına bələd idi, cəhl üzündən və qan axıdılmasından qorxduğu üçün kənara çəkildi və bəzilərinin əqidəsincə xudxahlıq və .rəyasət tələblik onu bu işdən saxladı

Abdüllah ibni Ömər ikinci xəlifə Ömər ibni Xəttabın oğlanlarından idi. O, da İmam Əli (٢ (əleyhissalam)-la beyət etmədi və Əli (əleyhissalam)ın rəhbərlik dəstgahından eləcə də tamaşaçıların sırasından kənara çəkildi və tədqiqatçı Kaşani nəql edir. O

vaxt ki, Həccac ibin Yusif Səqəfi (Əbdul Məlik ibni Məvranın qan içən cəlladı) Məkkəyə varid oldu və Müsəb ibni Zübeyri dardan asdı Əbdüllah ibni Ömər Həccacın yanına :gəldi və dedi

Əlini mənə ver səninlə beyət edim ki, məminlə Əbdül Məlik arasında vasitəsən, çünki“ :Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən eşitdim ki, buyurdu

Hər kəs ölsə və öz İmam zamanını tanımasa, o, cahiliyyət zamanının ölüsü kimidir.”“ Həccac ayağını uzatdı və dedi: “Ayağımı tut! Hələlik əlim məşğuldur.” Abdullah dedi: ”?“Məni məsxərə edirsən

Ey Bəni Ədi qəbiləsinin axmağı, sən Əli (əleyhissalam)-la beyət etmədin, indi də-gəlmisən ki, burada deyirsən Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm belə !?buyurdu

And olsun Allaha sən Peyğəmbərin səlləllahu əleyhi və alihi və səlləm buyurduğuna“ körə buraya gəlməmisən, əksinə bu dar ağacının qorxusundan ki, Müsəb ibni Zübeyr ”!?onun üstündə asılıdır, bura gəlibsən

Nəhayət Əbdüllah ibni Ömər hicri ٧٣-cü ilində Müsəb ibni Zübeyrin qətlindən üç ay keçəndən sonra Həccacın məmur etdiyi bir nəfərin vasitəsi ilə zəhərləndi və dünyadan getdi. Bu tərtiblə buradan, müəyyən qədər Səd ibni Əbi Vəqqas və Əbdüllah ibni Ömərin zahiri şəxsiyyətləri ilə tanış olduq və anladıq ki, bu iki nəfər Əli (əleyhissalam)-.la beyət etmədilər

Haris ibni Hut üçüncü adamdır ki, Əli (əleyhissalam)-ı himayət etmədi və kənara (٣ çəkildi. O, Əli (əleyhissalam)-ın hüzuruna gəldi və özünün kənara çəkilməsinin səbəbini :belə izah etdi

Sən elə güman edirsən ki, mən Cəməl səhabələrini (Təlhə, Zübeyr və s.) kimiləri“ ”!?azğınlıq yolunda bilirəm

Daha aydın ibarətlə: Mən ki, müharibədən və sizi himayə etməkdən kənara çəkilməmişəm. Axı mən, Cəməl əshabı ilə müharibəni rəva bilmirəm. Mən bu çürük ”!?başlılar və adamlarla necə müharibə edim

İmam Əli (əleyhissalam) ona buyurdu: “Sən yerə baxırsan və başının üstünə baxmırsan (maddi işlərə və dünyanın məhdud qəfəsinin daxilinə baxırsan nə mənəvi ”.kamallara yox). Buna görə də gic və heyran qalıbsan

Haris dedi: Mən Səd ibni Əbi Vəqqas və Abdullah ibni Ömər (iki məşhur şəxslər) kimi .kənara çəkilirəm

:İmam (əleyhissalam) buyurdu

”.Səd və Əbdüllah ibni Ömər nə haqqa kömək etdilər, nə də batili xar etdilər“

!?Hər ikisi tamaşaçı idilər). Yəni sən istəyirsən bu iki nəfəri özünə rəhbər biləsən)

Bir halda ki, bu iki nəfər tamaşaçıdırlar və islama təəhhüdləri yoxdur. Bir Şəxsdən örnək götürməyi meyarı və əsası budur ki, o şəxs haqqın hamısı və tərəfdarı ya batili .xar edən olsun

***

Deyilməmiş qalmasın ki, “Nəhcül-Bəlağə”nin ١٨-ci hikmətində gəlib: İmam Əli (əleyhissalam) o kəslər barəsində ki, onunla birlikdə döyüşməkdən kənara çəkildilər :buyurdu

”.Bunlar haqqı tək qoydular və batilə kömək etdilər“

Bu tərtiblə İmam (əleyhissalam) məs”uliyyət yükünün altından çiyinlərini kənara çəkən və səhnələrdə hazır olmayan tamaşaçıları tənqid etdi. Hərçənd ki, sabiqəli şəxslər və ricaldan olsalar da. Çünki, gərək həmişə haqqa kömək edəsən və batillə barışmaz .düşmən olasan

## İMAN”–IN MƏNASI”–۱۲۶

Bir kişi Əli (əleyhissalam)–ın hüzuruna gəlib xahiş etdi ki, imanı ona şərh və bəyan .etsin

İmam (əleyhissalam) buyurdu: “Sabah mənim yanıma gəl, camaatın hüzurunda səni ondan agah edim ki, dediklərimi unutsan onda başqaları sənin üçün onları hifz edib ”.saxlasın

”.Zira, söz, qaçan dəvə kimidir ki, bəziləri onu tapır bəziləri isə tapmırlar“

:O günün sabahı oldu. İmam (əleyhissalam) camaatın arasına gəlib belə buyurdu

:Səbr dörd sütun üzərində qərar tutub

İştiyaq–۱

Qorxu–۲

Zöhd–۳

İntizar–۴

:İman da dörd sütun üzərində qərar tutub

Səbr–۱

Yəqin–۲

Ədalət–۳

Cihad–۴

:Yəqin də dörd şöbədən ibarətdir

Ayıqlığı görmək-۱

Hikmət dəqiqələrinə çatmaq-۲

Hikmətlərdən nəsihət almaq-۳

.Keçmişdəkilərin necə hərəkət etdiklərinə diqqət etmək-۴

:Ədalət də dörd şöbədən ibarətdir

Anlamaqda diqqət-۱

Elm və biliyin dərinliyinə varmaq-۲

Düzgün mühakimə-۳

Sabit və möhkəm helm-۴

:Cihadın da dörd şöbəsi vardır

Əmr be məruf-۱

Nəhy əz münkər-۲

Müharibə cəbhəsində sədaqət və düzgünlük-۳

...Fasiqlərlə düşmənlik və onlara qarşı kin-۴

Bu tərtiblə İmam (əleyhissalam) tam inayət və diqqətlə adamların suallarına cavab verdi. Belə ki, Həzrət ictimai məsələlərə, insanların əxlaqi və əqidəti məsələlərinə çox .ciddi əhəmiyyət verirdi

## KƏ"BƏNİN ZİVƏRLƏRİ-۱۲۷

Ömər ibni Xəttabın xilafəti zamanı idi. Qədimdən Kə"bəyə zivərlər (pərdə və ...) gətirmişdilər və orada yığılmışdı. Bu zivərlər barədə Ömərin hüzurunda söhbət oldu və ona dedilər: "Əgər bu zivərləri alsaydın (satsaydın və onun pulu ilə) islam ordusunu "!?mücəhhəz etsəydin, mükafatı daha çox olardı. Kə"bə zivər və zinəti neyləyir

Ömər onların təklifini qəbul etdi və həmin işi icra etməyi qərara aldı. Sonra Ömər bu barədə Əli (əleyhissalam)-la məsləhətləşdi və İmam Əli (əleyhissalam) cavabında buyurdu: O vaxt Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmə Quran nazil oldu. Allah :Quranda malları dörd ünvan altında qərar verdi

.İrs "fəraiz" qanununa əsasən vərəsə arasında bölünür-۱

.Fəyy bir növ hərbi qənimətdir ki, o, ehtiyacı olanlara verilir-۲

.Xüms onun məsrəfi də təyin olunubdur-۳

Sədəqələr və Zəkat ki, onun da məsrəf səbəbləri müəyyən olub və elə həmin yerlərə-۴

də sərf olunur. Quran nazil olduqda, Kə”bənin zivərləri də öz yerlərində idilər. Allah onları həmən halında qoydu. Belə ki, nə onu unutmuşdu nə də o zivərlər Allahdan gizli qalmışdı. Buna görə sən də onları həmən halında ki, Allah və Peyğəmbəri qərar .veriblər qoy, o cür qalsın

:Ömər bu dəlillərdən qane olub dedi

.Əgər sən olmasaydın, rüsvay olardıq.” Və Kə”bənin zivərlərini olduğu kimi saxladı“

## BEYTÜL–MAL OĞRUSUNUN ƏLİNİN KƏSİLMƏSİ–١٢٨

İki nəfər oğrunu Əli (əleyhissalam)-ın hüzuruna gətirdilər ki, onların arasında hökm yürütsün. Hər iki oğru beytül-maldan bir şey oğurlamışdılar. Təsadüfən bunların hər .ikisi qul idilər. Bu fərqlə ki, biri beytül-malın qulu, o birisi isə camaatın qulu idi

İmam (əleyhissalam) Beytül-mal qulu barədə buyurdu: “Bu özü Allahın malıdır və ona ”.hədd yoxdur. Çünki, Allah malının bir hissəsini öz malından yemişdir

Camaatın qulu barədə isə belə buyurdu: “Gərək ona şiddətli hədd icra olunsun və əli ”.kəsilsin

## ƏLİ (ƏLEYHİSSALAM)–IN QARDAŞ VƏ DOSTLARININ ÜSTÜNLÜKLƏRİ–١٢٩

Bir gün Əli (əleyhissalam) özünün dost və qardaşları barədə (misal ünvanıyla) danışırdı və istəyirdi arxadaşlara desin ki, mənim dostum və qardaşım o kəsdir ki, mənimlə məktəb bağlılığı olmuş olsun. Belə bir adam ilə gərək müəyyən üstünlüklərə malik olsun. Arxadaşlar qulaq vermişdilər ki, görsünlər o üstün cəhətlər nədir? Görəsən o üstün cəhətlər onlarda vardır ki, Əli (əleyhissalam)-ın dost və qardaşı hesab !?olunsunlar ya yox

Hər halda bu zamanda da Əli (əleyhissalam)-a əlaqəmənd olanlar gərək diqqətlə bu haqda fikirləşsinlər ki, Əli (əleyhissalam)-ın dostu və qardaşıdırlar ya yox? O Həzrət :özünün həqiqi dost və qardaşı üçün Onu üstün cəhət saydı

:Mənim keçmişdə bir qardaşım var idi. Dini qardaş ki, bu üstün cəhətlərə malik idi

Dünya onu nəzərində həqir və kiçik idi-١

.Yeyib-içməyə ürək bağlamamışdı və öz qarnının əsiri deyildi-٢

Sakit idi və çərənçilik etməzdi-٣

Əgər söz danışardısa, onun sözü haqq və faydalı idi. Belə ki, pərəstiş edənlərin-۴ .yanğısını söndürürdü

.Zahirdə zəif bir insan və müstəzəf (təvazökar) idi-۵

Cihad və döyüş zamanı meydanda tək idi və şir kimi coşurdu və səhra ilanı kimi-۶ hərəkət edirdi

.Məhkəməyə daxil olmazdan əvvəl dəlil göstərməzdi-۷

Heç kəsi iş barədə (imkan daxilində üzr qəbul etmək) üzrünü eşitməzdən qabaq-۸ .məzəmmət etmirdi

.Heç bir dərddən sağalana qədər gilayə etmirdi-۹

.Dediyinə əməl edirdi və o şeyə ki, əməl etmirdi demirdi-۱۰

Hər vaxt başqa bir şəxslə danışdıqda elə ki, ondan haqq söz eşidirdi sükut edirdi (və-۱۱ .(haqqa təslim olurdu

Eşitməyə daha çox həris idi, nəinki danışmağa və başqalarının nəzərini vaizlərin-۱۲
.danışığına diqqət yetirməyə cəlb edirdi

Hərgah onun qarşısına iki iş çıxasaydı, fikirləşirdi ki, onlardan hansı biri nəfsani-۱۳
həvəslərə daha yaxındır. Həmişə də həva və həvəsdən uzaq, əql və hidayətə daha
.yaxın olanı seçərdi

:Sonra buyurdu

Gərək siz bu cür gözəl əxlaqda olasınız! Bu üstünlüklərin olmasında bir-birinizdən irəli“
gedin və əgər onların hamısını icra etməyə qüdrətiniz yoxsa bilin ki, onların az
”.miqdarını yerinə yetirmək çoxunu tərk etməkdən daha yaxşıdır

Mövləvi demişkən: “Əgər dənizin suyunu çəkmək olmazsa, gərək susuzluğa qədər
”.dadmaq

Bəziləri deyirlər: “İmamın bu qardaşdan məqsədi ya Peyğəmbər, səlləllahu əleyhi və
alihi və səlləm ya Əbuzər, ya da Miqdad olubdur. Amma əllamə Xoyi “Nəhcül-
.Bəlağə”yə öz şərhində bu deyimi misal ünvanıyla bəyənibdir

## (ƏLİ (ƏLEYHİSSALAM)–IN MÜHARİBƏ MEYDANINDA (TƏMKİNİ–۱۳۰

:Əbu Həyyan Teymi atasından nəql edir ki, dedi

Siffeyn müharibəsndə cəbhədə Əli (əleyhissalam)-la yoldaş idim. O Həzrət polkları“
hazırlayır və cəbhənin ön xəttinə göndərirdi. Döyüş meydanında Müaviyəni bir atın
belində gördüm ki, az qalır yerə yıxılsın. Əli (əleyhissalam)-ı da gördüm ki, onun bir
neçə addımlığında ata minib Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin şəmşirini
əlinə alıb rəcəz oxuyur. Bu halda Əli (əleyhissalam)-ın ordusunun əsgərlərindən biri
irəli gəldi və Əli (əleyhissalam)-ma dedi: “Ya Əmirəl-möminin! Özünü gözlə və
”.zənnimcə bu məl”un (Müaviyəyə işarə) hiylə edib səni qafilgir etmək istəyir

”.İmam buyurdu: “Yox canım! Əcəl və qəti tale insanı qorumaq üçün kifayətdir

Hər bir insan xüsusi mələklər vasitəsilə qorunub saxlanılır. O vaxt ki, insanın əcəli çatdı
o mələklər onu buraxırlar. Bu mətləb Nəhcül-Bəlağədə ۶۲-ci xütbədə gəlib: O vaxt ki,

:Həzrəti ölümlə hədələdilər, buyurdu

Allah mənim üçün möhkəm sipər qərar verib. Bu da həmən əcəldir ki, məni“ hadisələrdən hifz edir və o vaxt ki, ömrümün sonu çatdı o sipər məndən uzaqlaşır və məni hadisələrə təslim edir. O, gün də nə nizə yana gedər nə də yara sağalar.” ٢٠١ :nömrəli Qisar kəlmələrində belə gəlib

Hər bir insanla iki mələk yoldaşdır ki, onu qoruyur, lakin müqəddəratı yetişdikdə onu .buraxırlar. Əcəl möhkəm sipərdir

səh:١٢٩

Ənəs ibni Malik məşhur müsəlmanlardan biri və ənsarın Xəzrəc tayfasından idi. O zaman ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm Mədinəyə hicrət etdi. Ənəsin anası onun əlini ki, ١٠ yaşında idi tutdu və Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin hüzuruna gəlib və ərz etdi: “Hər kəs sizə bir töhfə gətirdi, lakin mənim dünya malından bir şeyim yoxdur.” Bu övladımı mögəvliyə qəbul et. Həzrət qəbul etdi və Ənəs on il Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin xidmətində durdu. ٩٣ hicri ilində isə vəfat etdi və Bəsrədə evinin yanında dəfn edildi. Ənəs o adamlardandır ki, hicrətin ilk illərinin cəryanlarından Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin rehlətinə qədər baş verən hadisələrə yaxından nazir və şahid idi. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən çoxlu hadisələr və rəvayətlər eşitmişdi. O vaxt ki, Təlhə və Zübeyr öz orduları ilə Bəsrəyə gəldilər və arada camaatı Əli (əleyhissalam)-a qarşı qiyam etməyə dəvət etdilər. Və bununla da Cəməl müharibəsini vücuda gətirdilər. İmam Əli :(əleyhissalam) Ənəs ibni Malikə buyurdu

Təlhə və Zübeyrin yanına get və Peyğəmbərdən onlar haqqında n əeşitmisənsə onlar“ .(üçün danış. (bəlkə düz yola qayıdaları və müharibəni qızışdırmaqdan əl götürələr

İbni Meysəmin fikrincə onlar Peyğəmbərdən eşitmişdilər və Əli (əleyhissalam) Ənəsə buyurdu ki, onların yanına get və yadlarına sal. Bu idi ki, bir gün Peyğəmbər səlləllahu :əleyhi və alihi və səlləm Təlhə və Zübeyrə buyurdu

Tezliklə siz, Əli (əleyhissalam)-la müharibə edərsiniz, bir halda ki, siz ona zülm və“ .(sitəm edirsiniz (siz zalim və batil cəhətində qərar tutmusunuz

Ənəs ibni Malik Əli (əleyhissalam)-ın fərmanından boyun qaçırdı (dünyası təhlükəyə düşməmək üçün haqqı tapdaladı) və Əli (əleyhissalam)-a ərz etdi: Mən onu yaddan .çıxarmışam

:İmam Əli (əleyhissalam) ona buyurdu

Əgər yalan desən, Allah başını Ağ alışığa (bərəs xəstəliyi) mübtəla etsin ki, heç“ əmmamən onu örtə bilməsin.” Şərif Rəzi deyir: Bərəs xəstəliyindən məqsəd (pis iylənmiş)-dir ki, bir müddətdən sonra bərəs xəstəliyinin ağ ləkələri Ənəs ibni Malikin

.üzündə aşkar oldu və məndən sonra heç kəs onu niqabsız görmürdü

Məşhur sünnü alimi ibni Əbil Hədid deyir: "Əli (əleyhissalam) Rəhbədə (geniş və məşhur yer) Kufədə camaatı and verib buyurdu: "Sizi Allaha and verirəm, məgər sizdən bir kişi Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən eşitməyibdir ki, o :Həzrət "Həccətül-vida"-dan qayıdandan sonra mənim barəmdə nə buyurdu

Hər kəs ki, mən onun mövla və rəhbəriyəm, Əli (əleyhissalam)-da onun rəhbəridir." İlahi Əli (əleyhissalam)-ı sevənləir sən də sev və düşmən san o kəsi ki, onu düşmn ".sanır

səh:۱۳۰

Bir qrup qalxıb buna şəhadət verdilər. Əli (əleyhissalam) Ənəs ibni Malikə buyurdu: ”!?“Sən də orada (Qədirdə) hazır idin bəs niyə indi şəhadət vermirsən

Ənəs dedi: “Ya Əmirəl-möminin! Mən qocalmışam, yaddan çıxardıqlarım yadımda ”.qalanlardan artıqdır

İmam (əleyhissalam) ona buyurdu: “Əgər yalan desən Allah başını ağ alışığa mübtəla ”.eləsin ki, əmmamən belə o ağlığı örtə bilməsin

.O ölməmişdən qabaq bərəs (xora) xəstəliyinə mübtəla oldu

## FÜRSƏT AXTARAN YƏHUDİYƏ DİŞ SINDIRAN CAVAB–۱۳۲

Həzrət Musa (əleyhissalam) Firon və Fironçulara qalib gələndən sonra tağutlarınn fitnə və əziyyətlərindən rahat olsa da böyük daxili çətinliklərlə qarşılaşdı. O cümlədən budur ki: Bəni İsrail Musa (əleyhissalam)-la dənizdən keçəndən sonra onlar öz yolları boyunca bir qrupu gördülər ki, xuzu və təvzöylə öz bütlərinin ətrafını tutmuş və onlara pərəstiş edirdilər. Cahil və korqəlbli adamlar bu mənzərənin təsiri altında qərar tutub aşkarcasına Musaya dedilər: “Ey Musa! Bizə bir məbud qərar ver necə ki, onların özləri ”.üçün məbudları vardır

Həzrət Musa (əleyhissalam) bu cahilanə təklifdən çox narahat oldu və onlara buyurdu: ”.“Siz cahil və xəbərsizsiniz

Bir gün bir nəfər yəhudi Əli (əleyhissalam)-ın hüzurunda müsəlmanlara irad tutdu ki; ”!?“Siz hələ peyğəmərinizi torpağa tapşırmamışdınız ki, ixtilaf etdiniz

:İmam Əli (əleyhissalam) onun cavabında bu diş sındırıcı cavabı verdi

Biz Peyğəmbərdən yetişən dəstur və sözlər barəsində ixtilaf etdik, nəinkin“ Peyğəmbərin özü və nübuvvət barədə (ta yaradanın Allahlığına dair), amma sizin ayağınız hələ dənizin suyundan qurumamışdı ki, Peyğəmbərinizə təklif etdiniz “bizim ”üçün məbud qərar ver, necə ki, bütpərəstlərin məbudları vardır

”.Musa (əleyhissalam) isə onlara belə cavab verdi: “Siz nadan cəmiyyətsiniz

## XƏVARİCLƏRİN NİKBƏTLİ, XARLI SONU–١٣٣

Əli (əleyhissalam)-ın dünənki dostları nadanlıq nəticəsində o Həzrətin yeni düşmənləri oldular və onun təht əmrindən çıxdılar. Ona görə bunlara Xəvaric deyirlər. Onlar nəinki bununla kifayətlənmədilər, əksinə Əli (əleyhissalam)-a qarşı müharibə

elan etdilər və Əli (əleyhissalam)-ın arxadaşlarından bir neçə nəfərini öldürlülər. Nəhayət Əli (əleyhissalam) Nəhrəvanda onlarla qanlı müharibə etdi və onların hamısını həlakətə yetirdi. (٩ nəfərdən başqa ki, qaçdılar) Müharibədən sonra Həzrət onların :ruhsuz cəsədlərinin yanına gəldi və onlara nəzər salıb xitabən buyurdu

Sizə əzab və nikbət olsun. Doğrudan da o adam ki, sizi aldatdı, sizə əvəz olunmaz“ ”.zərər və ziyan varid etdi

:Bir şəxs o Həzrətdən soruşdu

”?Onları kim aldatdı“

İmam buyurdu: “Hiyləgər şeytan yoldan azdırandır və əmmarə nəfs onları arzularla aldatdı və onların üzünə günah yolunu açdı. Beləliklə onlara qələbə və”dəsi verdi ki, ”.nəhayət onları cəhənnəmin yanar oduna atdı

İmam Əli (əleyhissalam) bu sözlərlə xəvaricin süqut, bədbəxtlik və zillətlərinin sirrini onların şeytan fətvasına əməl etmələrində və nəfsani həvəslərində bildi ki, onların fikri .və siyasi inkişafına mane oldu və onları səadət sərhəddindən xaric etdi

Və bu xəbərdarlıq və ixtar bizə və tarixin bütün insanlarınadır ki, xam arzulara ürək bağlamasınlar, ağla tabe olsunlar ki, xəvaricin nikbətli sonu kimi bir aqibət onların .ətəyini tutmasın

## ƏLİ (ƏLEYHİSSALAM)-IN MƏHƏMMƏD İBNİ ƏBU BƏKRİN MATƏMİNDƏKİ-١٣۴ YANDIRICI SÖZÜ

Əli (əleyhissalam)-ın müxlis, məhəbbətli və başbilən simalarından biri o Həzrətdən itaət yolunda şəhadətə yetişən Məhəmməd ibni Əbi Bəkrdir. O ziqədə ayının ٢۵-də “Həccətül-Vida” səfərində (١٠ hicri ili) Zul-həlifə diyarında (Mədinənin ehram bağlanan yeri) anadan oldu. Anası Əsma Ümeysin qızı idi ki, əvvəllər Cəfəri Təyyarın yoldaşı idi və Cəfərin şəhadətindən sonra Əbu Bəkrin həyat yodaşı oldu Əbu Bəkrin oğlu Məhəmməd də bu anadan doğuldu. Elə ki, Məhəmməd ibni Əbu Bəkr böyüdü, ali Əli və Əli (əleyhissalam)-ın haqq olduğunu bildi və ondan itaət yolunu seçdi. İmam Əli :(əleyhissalam)-ın ona o qədər məhəbbəti var idi ki, buyururdu

Əbu Bəkr sülbündən olan Məhəmmməd ibni Əbi Bəkr Əli (əleyhissalam)-ın qarşısında özündən elə ləyaqət və qoçaqlıq nişan verdi ki, Qeys ibni Səd ibni Übadəni o Həzrət .Misrin valiliyindən çıxardı və onun yerinə Məhəmməd ibni Əbu Bəkri təyin etdi

Məhəmməd Misrə getdi və İmam Əli (əleyhissalam) ona öz istəyinə əsasən hökuməti idarə etmək qaydaları haqqında şərhli bir məktub yazdı. Müaviyə Məhəmmədə çoxlu .məktublar yazdı ki, onu özünə tərəf cəlb etsin

səh:۱۳۲

Lakin bir nəticə almadı və Məhəmməd ona aldanmadı. Axırda Müaviyə Misri tutmaq üçün Əmr Asın rəhbərliyi altında böyük bir diviziyanı Misrin üzərinə göndərdi. Məhəmməd Misir camaatını müqabiliyə dəvət etdi və ordu hazırladı. Və onu Gənaət ibni Bəşərin komandanlığı altında Əmr Asa tərəf yolladı. İki ordu arasında şiddətli müharbə baş verdi. Nəhayət Kənanə şəhadətə yetişdi və get-gedə Misir ordusu məğlub olub və dağıldı. Sonra Əmr Asın ordusu Məhəmməd ibni Əbi Bəkri tutub Müaviyət ibni Müdəycin yanına apardılar və çox danışdıqdan eləcə də Məhəmməd ibni Əbi Bəkrin möhkəm cavablarından sonra nəhayət Misirdə Müaviyət ibni Xüdəycin göstərişi ilə onun başını bədənindən ayırdılar. Onun pak peykərini ölümş eşşəyin dərisinin arasına qoyub odladılar və bu tərtiblə ٣٨-ci ilin səfər ayında ٢٨ yaşında .Məhəmməd ibni Əbu Bəkr şəhadət şərbətini içdi

Elə ki, Məhəmməd ibni Əbi Bəkrin şəhadət xəbəri Əli (əleyhissalam)-a çatdı çox :məhzun oldu və buyurdu

O, şəhadətə yetişdi. Onu Allahın hesabına qoyuram. O, nəsihət qəbul edən və“ ”.xeyirxah bir övlad idi. Çalışqan, iti və kəsici şəmşir, eləcə də sütun idi

Əbdürrəhman ibni Müsəyyib Fəzari ki, Əli (əleyhissalam)-ın Şamdakı məxfi məmuru idi. Əli (əleyhissalam)-ın hüzuruna gəldi və dedi: “Elə ki, Məhəmmədin şəhadət xəbəri Şam camaatına çatdı və elə ki, Müaviyə onun öldürülməsi xəbərini mənbərdə elan etdi mən Şam camaatını heç bir vaxt bu cür görmədim ki, Məhəmmədin ölüm xəbərindən ”.xoşhal oldular

İmam (əleyhissalam) buyurdu: “Lakin bil ki, bizim kədərimiz Şam camaatının ”.şadlığından daha böyükdür

Məhəmmədin şəhadətində bizim hüzn və kədərimiz Şamlıların şadlığı qədərdir. Çünki,“ onlar bir düşməni əldən verdilər, biz isə bir dostu itirdik. O, haqqın dostu və batilin ”.düşməni idi

### YENİ DOĞULUŞDA TƏBRİK QAYDASI-١٣٥

.Allah bir kişiyə bir oğul vermişdi

O kişinin dostu yanına gəldi və ona belə təbrik dedi: “Bu balacanın qəhrəman qədəmi mübarək olsun”.

İmam Əli (əleyhissalam)-ın da orada hüzuru var idi və onun təbrik qaydasını eşitdikdə. buyurdu:

“Belə təbrik demə, əksinə bu cür de:

“Bağışlayana minnətdar ol və şükr et! Bağışlanan mübarək olsun. Ümidvaram böyüsün və sənin zəhmətlərinin qədrini bilsin. Və onun yaxşı əməllərindən xeyir görəsən”.

Bu tərtiblə nümunə oğulun ataya nisbətini belə tanıtdırdı ki, təkcə ataya heç bir ziyan və xətər yetirməz atası həmişə onun yaxşı işlərindən maddi və mənəvi xeyirlər görər.

səh:۱۳۳

## İMAMIN ƏZA SAHİBİNƏ BAŞSAĞLIĞI–١٣۶

Bir şəxs dünyadan getmişdi. İmam Əli (əleyhissalam) o şəxsin qalanlarının yanına getdi və onlara belə başsağlığı dedi: “Bu ölüm sizdən başlanmayıb və sizinlə də sona yetməyəcək. Sizin bu keçmiş təzə dost və yoldaşınız bəzi vaxt müsafirətə gedirdi. Budur o, yenə də müsafirətə gedib. Əgər səfərdən qayıtdı daha yaxşı, yoxsa siz ona tərəf gedəcəksiniz. Bu tərtiblə İmam (əleyhissalam) həm qalanlarına ürək-dirək verdi (ki, bu ümumi bir məsələdir) həm də onlara ibrət dərsi öyrətdi ki, bir gün siz də ölüm .karvanına qovuşacaqsınız

Deyirlər: Ölkələr fəth edən böyük və məşhur sərkərdə İskəndər ölüm astanasında anasına belə vəsiyyət etdi “Mənim cənazəmi İsgəndəriyyəyə aparın anama deyin təam süfrəsi açsın və bütün camaatı dəvət etsin məgər o kəs ki, əzizini və dostunu əldən vermiş olsa. Qoy iştirakçılar acı xatirəsiz məclisə varid olsunlar. Elə ki, onun anası bu vəsiyyəti eşitdi, vəsiyyətinə görə müfəssəl təam hazırladı və bütün camaatı ora dəvət etdi. Bu şərtlə ki, əzizinin və dostunun dağını görməmiş olsun. Yemək .zamanı heç kəs gəlmədi

Ana vaqiənin səbəbini soruşduqda dedilər: “Siz şərt etdiniz ki, o adam ki, onun qəlbində dost və əzizinin dağı yoxdur məclisdə hazır olsun. Dünyada elə bir adam yoxdur ki, belə olmuş olsun. Ana vəsiyyətin sirrini anlayıb dedi: “Oğlum mənə ən yaxşı yolla təsəlli ”.verdi

## ƏMMARIN MÜĞEYRƏ İLƏ TOQQUŞMASI–١٣٧

Müğəyrətibni Şebə besətin beşinci ilində islamı qəbul etdi. O, zirək adamlardan biri idi və “Ərəb şeytanı” kimi şöhrəti var idi. Bu şəxs Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin rehlətindən sonra inhiraf yolda addımlayır və həyatda hədəfi qarın və məqam ələ gətirməkdə görürdü ki, bu yolda hər cür haqqı tapdamaq rüşvətxorluq və zülmdən .çəkinmirdi

Nəhayət Müaviyə tərəfindən Kufənin valisi oldu və yeddi il neçə aysa Kufədə hökumət etdi Müaviyənin göstərişlərini bir-bir icra etdi və nəhayət ۴۹-cu hicri ilində taun .xəstəliyi nəticəsində Kufədə dünyadan getdi

Bu napak şəxsin müqabilində Əmmar Yasir adlı böyük və qiymətli bir adam var idi ki, düz onun əksinə olaraq Müaviyənin ən barışmaz düşmənlərindən idi. Və Əli (əleyhissalam)-ın ən müxlis arxadaşlarından və çox yaxın dostlarından hesab olunurdu. Əmmar Yasir axırda Siffeyn müharibəsində və mövlası Əli (əleyhissalam)-ın rikabında şəhadətə yetişdi. Bir halda ki, ۹۴ il ömründən keçirdi.

Nəticə budur ki: Əmmar İmam Əli (əleyhissalam)-ın mehvərində addımlayırdı, Müğeyrə isə Müaviyənin mehvərində, ta bir gün bir mövzu üstündə Əmmar ilə Muğeyrə arasında düşməncəsinə söhbət və danışıq başladı. Bu xəbər Əli (əleyhissalam)-a

çatdı. Əli (əleyhissalam) Əmmarı istədi və ona buyurdu: “Ey Əmmar! Onu (Muğeyrəni) burax! O, dini özünün dünyəvi mənafeyinə uyğun şəkildə əxz edibdir və əmələn haqqı özünə müştəbeh edibdir ki, öz batil şübhələrini özünün şum məqsədlərinə çatmaq ”.üçün körpü qərar versin və onu özünün xilaf işləri üçün bir üzr kimi qələmə versin

Başqa sözlə Muğeyrə daha islah olunası deyil, qəlbi qaralıb və dünyanın zərq bərqi onu .kar və kor edibdir ki, ona nəsihət etmək yumuruq vurma deməkdir

## HƏQİQİ, KAMİL İSTİĞFAR VƏ TÖVBƏ–۱۳۸

:Bir şəxs İmam Əli (əleyhissalam)-ın hüzurunda dedi

Allah dərgahından günahlarımın bağışlanmasını tələb edirəm.” Bir adamın bu cümləni“ səmimi qəlbdən ona etiqadı olub dilə gətirməsi çox göründükdən İmam Əli :(əleyhissalam) ona buyurdu

”!?Anan yasında otursun bilirsən istiğfarın mənası nədir“

İstiğfar–yüksək mərtəbəlilərin, şərif və mənəviyyatın yüksək səviyyəsində olanların .məqamıdır

Sonra İmam (əleyhissalam) daha çox izah üçün belə buyurdu: “İstiğfar bir kəlməsidir, :lakin onun altı məna və məfhumu vardır

.Keçmiş günahlardan peşmanlıq (۱

.Yenidən günaha tərəf qayıtmamaq üçün əbədi və qəti qərar (۲

Haqqun-nası əda etmək, belə ki, Allahla o cür görüşəsən ki, heç kimə borclu ( ۳ .olmayasan

(...Haqqullahı yerinə yetirmək (namaz, oruc, həcc (۴

Diqqət edəsən o ətə ki, haram mal yeməkdən bədənində göyəribdir və onu keçmiş (۵ günahlarınla əlaqədar qəm və peşmanlıqla əridəsən ta onun yerinə təzə halal ət .gəlsin. İlahi əhkamlardan itaət və onun ardınca getmək

İtaətin çətinliyini özünə elə dadızdırasan ki, guya günahın ləzzət və şirinliyini ( ۶ :dadırsan. Bu mərhələləri yerinə yetirəndən sonra deyə bilərsən: deyəsən

".İlahi dərgahından bağışlanmaq tələb edirəm"

Deyilməmiş qalmasın ki, tövbənin mərhələləri var. Şəri tövbə həmən dörd əvvəlki xislətlə hasil olur. Lakin, həqiqi və kamil tövbə isə yuxarıda göstərilən mərhələlərdən .keçməkdən asılıdır

## ƏLİ (ƏLEYHİSSALAM)–IN SƏBRİ VƏ DÖZÜMÜ–۱۳۹

.Təəssüflü Həkəmeyn hadisəsi Əli (əleyhissalam)–ın hökuməti zamanı baş verdi

Əli (əleyhissalam)-ın dünənki arxadaş-larının bir hissəsi o Həzrətin kinli düşmənləri .olmuşdular və Xəvaric ünvanıyla fitnəçiliklə və odlandırıcılıqla məşğul idilər

Əli (əleyhissalam) əshab və arxadaşlarının kənarında əyləşmişdi. Bu dəmdə oradan gözəl bir qadın keçdi. Yığışanların gözü o qadına düşdü və onların hamısının diqqəti ona cəlb oldu. İmam Əli (əleyhissalam) buyurdu: “Bu camaatın gözləri bərk axtarışdadır (qadın görmək üçün həris olur) ki, bu da şəhvətin coşmasına və həyacana səbəb olacaq. Buna görə diqqətli olun ki, hərgah sizlərdən birinin gözü gözəl bir qadına düşdükdə öz həyat yoldaşınızla əlaqədə olun. Çünki, həyat yoldaşınız da o qadın ”!kimidir

Xəvaricdən biri (rahatcasına və tamam azadlıqla) dedi: “Allah, bu kafiri öldürsün nə ”.!qədər bilikli və agahdır

Əshab (onun cəsarətindən narahat oldular) öz yerlərindən sıçradılar ki, onu qətlə :yetirsinlər, İmam (əleyhissalam) onlara buyurdu

Sakit olun, söyüşün cavabı ya söyüşdür, ya bağışlamaqdır, ya da günahından“ ”.keçmək

:Bu cərəyan bizə bir neçə mətləbi öyrədir

.Əli (əleyhissalam)ın səbrani yüksəkliyi (١

.Əli (əleyhissalam)-ın hökumətində azad-lıq (٢

Əli (əleyhissalam)-ın əfv və alicənab-lığı (٣

.Halal yolla coşan cinsi həvəsin söndü-rülməsi və haramın tərk edilməsi (۴

Deyilməmiş qalmasın: bu nəzərlə ki, Xəva-ric cəhalət üzündən Əli (əleyhissalam)-ın kafir olmasına mötəqid idilər. Onların nasəza demələri islama mötəqid olan şəxsin, yəni Əli (əleyhissalam)-ma nasəza deməsidir ki, ٢-cisinin həddi var və birincidə isə .hədd yoxdur

Tarixdə çox görünüb ki, bəzən oğul atanın yolunun azmasına səbəb olur və bəzən də əksinə, ata oğulun yoldan azmasına səbəb olur. O cəhətlərdən biri ki, oğul atanın .yolunu azmasına səbəb oldu Zübeyrin oğlu Əbdüllahın macərasıdır

Zübeyr ibni Əvam ibni Xuvəylid Həzrəti Xədicənin qardaşı oğlu və Peyğəmbərin səlləllahu əleyhi və alihi və səlləmin bibisi oğlu idi. Zira anası Səfiyyə Əbdülmütəllibin qızı idi. Zübeyr islamın sərdarlarından, möhkəm və sabit qədəm müsəlmanlarından idi ki, öz şəmşiri ilə dəfələrlə islamın hərimini müdafiə etmişdi hətta Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm onu həvarilərindən (yaxın arxadaşlardan) hesab edirdi. Lakin, o, Əli (əleyhissalam)-ın xilafəti zamanı bu qədər layiq keçmişi ilə haqq yolundan münhərif oldu və Təlhə ilə birlikdə Cəməl müharibəsini başladı. Amma müharibənin

başlanğıcında Əli (əleyhissalam) ona nəsihət etdikdə bir qədər özünə gəldi və kənara çəkilərək və öz evinə qayıtdı. Amma yol boyunca ibni Curmuz adlı bir şəxs onu qafilkir .edib və öldürdü və o, ۶۷ yaşında hicri ۳۶-cı ildə Vadiyüs-səbada qətlə yetirildi

Zübeyrin ۲۰ övladı var idi. (on bir oğlan və doqquz qız) onun tanınmış oğlanlarından biri Abdüllah idi. İbni Əbil Hədid yazır: Abdüllah atası Zübeyr və xalası (Aişə) ilə birlikdə Cəməl müharibəsniin başlanmasında iştirak edirdi... Abdüllah namazda, orucda və .ibadətdə çox təzahür idi

Bununla belə rəyasət tələblik onu yoldan çıxardı. Cəməl müharibəsində Əli (əleyhis-.salam) ilə müharibə etməyin cəhənnəmdən başqa aqibəti yoxdur

Aişə dedi: "O vaxtdan ki, ağlım kəsməyə başlamışdır, heç bir məkanda bu məkandakı kimi şəkk və şübhədə olmamışam. Əli (əleyhissalam) mənim yadıma bir sözü saldı ki, "...!?Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmdən eşitmişəm

?Aişə dedi: Nə etmək istəyirsən

.Zübeyr dedi: İstəyirəm müharibədən geri çəkiləm

Bu arada Zübeyrin oğlu Abdüllah üzünü atasına tutub dedi: "Sən bu iki ordunu burda yığdın indi ki, bir-birini əzmək üçün şəmşirləri itilədilər istəyirsən, onları buraxıb ?qaçasan

Bəli, ey ata, sən həqiqəti demirsən, əksinə sən Əli (əleyhissalam)-ın bayrağını daşıyan "...igid oğullardan ki, ölümü çiyinlərində daşıyırlar qorxmusan

Bu tərtiblə Abdüllah atasını Əli (əleyhissalam)-la müharibəyə təhrik edirdi və onun kənara çəkilməsinə maneçilik törədirdi. Vəli Zübeyr onun sözünə qulaq vermədi və Bəsrədən xaricə çıxdı. Həmin əsasa görədir ki, İmam (əleyhissalam) öz danışıqlarının :bir qismətində buyurur

Zübeyr həmişə biz Əhli-beytdən idi–o zamana qədər ki, naxələf oğlu Abdullah" ".böyüdü

Bu tərtiblə İmam gələcək ataya xəbərdarlıq edib ixtar verdi ki, öz dinlərini qorusunlar

və dinlərini öz övladları xatirinə əldən verməsinlər. Yuxarıdakı danışıqdan istifadə olunur ki, Zübeyr bu barədə səhlənkarlıq ya işi pozmaqla məşğul idi. Oğlu Abdüllah isə onu bu işə məcbur edirdi və arzu edirdi ki, atası ali məqam və rəyasətə yetişsin. Ta o, da öz atasının məqamından sui istifadə etsin. Bəli, Zübeyr nübüvvət xanədanından idi. .Amma oğlu onu bu böyük iftixardan məhrum etdi

***

İlahi! Sənə çox şükr deyirik ki, bu gücsüzə güclü tovfiq inayət etdin ki, "Nəhcül-bəlağə" okeanının dalğalarında öz bacarığıma görə üzüb faydalanam və bu kitabı ki, ۱۴۰ dastanı əhatə edir, haqq vurğunları və ədalət aşiqlərinə hədiyyə edim. Bununla da qoy Əli (əleyhissalam)-ın iş bacarığı və yolunu tanıyıb bu yolda addım atsınlar. Hər nə qədər bu böyük elmi və ədəbi dəryada çox üzürdümsə başa düşürdüm ki, heç bir .qələmin bu böyük hikmətləri layiq olduğu kimi qələmə almaq iqtidarı yoxdur

Pərvərdigara! Sənə hədsiz şükr edirəm. Tovfiq inayət etdin ki, böyük təqva və ədalət məktəbi ilə sıx bağlılığımız olsun. Dünya və axirətdə bu böyük İmamın ardıcıllarından .olaq

Amin Ya rəbbəl-aləmin, vəlhəmdu lillahi Rəbbil aləmin

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹